**“ELMİ İŞ”**
**jurnalının qeydiyyata alındığı təşkilatlar**

**Organizations in which the magazine**
**“SCIENTIFIC WORK” is registered**

**Организации, в которых зарегистрирован журнал**
**«НАУЧНАЯ РАБОТА»**

**FƏLSƏFƏ PHILOSOPHY ФИЛОСОФИЯ**

**Salmanova Şəlalə Sabir qızı**
Bakı Dövlət Universiteti

# İSLAM MƏDƏNİYYƏTİNİN ƏSASINI TƏŞKİL EDƏN VACİB AMİLLƏR

***Açar sözlər:*** *İslam, cəmiyyət, mədəniyyət*
***Key words:*** *Muslim, society, culture*
***Ключевые слова:*** *Ислам, общество, культура*

İslam dini orta əsrlər müsəlman xalqlarının həyatında böyük rol oynamışdır. Lakin başlanğıcda teokratik dövlət kimi müsəlman ərəb icmasından doğan nəhəng İslam imperiyasına daxil olan xalqların, ilk növbədə irandilli və türkdilli xalqların dillərinin inkişafı X-XI əsrlərdə ərəb mədəniyyətini müəyyən gədər zəiflətdi. Xilafətin VIII əsrdə başlanmış, X əsrdə başa çatmış siyasi süqutu mədəni parçalanmaya səbəb oldu. Bu proses vahid müsəlman təriqətçiliyindən yaranmış sosial münaqişələrin təsiri altında gücləndi. İslamagədər mövcud olmuş yerli mədəni ənənələr getdikcə özünü göstərməyə başladı, nəticədə yerli-milli mədəniyyətlər formalaşdı. Bununla belə, orta əsrlər tarixinin müəyyən mərhələsində vahid islam dövlətinin tərkibində olmuş, xalqlar üçün müsəlman mədəniyyəti ümumi fenomen olmuşdur. İslama cəlb olunmuş yaxud onu gəbul etmiş xalqların ictimai həyatında, milli ənənələrində və tarixi talelərində mühüm fərqlərin olmasına baxmayaraq onların mürəkkəb və uzun müddət davam etmiş qarşılıqlı təsirində və mədəniyyətlərinin sintezi sayəsində onların hamısı ücün ümumi və vahid müsəlman mədəniyyəti yaradılmış və bu mədəniyyət bir çox əsrlərdə onların dünyagörüşlərini,ənənələrini, təsərrüfat formalarını, mənəvi norma və ideallarını, fəlsəfəsini, psixologiyasını, ədəbiyyatını və incəsənətini, insanların davranış modelini müəyyən etmişdir. O da bəllidir ki, ümummüsəlman mədəniyyətinin qəbul edilməsi bu mədəni sferaya daxil olmuş xalqların psixologiyasında, incəsənətində və məişətində özünü göstərən mədəni özünəməxsusluqdan məhrum etmədi.

Biz burada xilafətin “ərəbləşdirilmiş” ayrı-ayrı əyalətlərinin ictimai və mədəni inkişafın ozünəməxsusluğuna toxunmuruq. O ayrıca bir tədqiqatın mövzusudur. Məqsədimiz ərəb mədəniyyətinin çiçəkləndiyi və dünyəvi məna kəsb etdiyi VII-XII əsrlərdə xilafətin bütün əyalətləri üçün ümumi olmuş ərəb-müsəlman mədəniyyətinin müəyyən elementlərini-dövlətçilik prinsiplərini, fəlsəfəsini, ədəbiyyatını və incəsənətini tədqiqatımızın həcminə uyğun səviyyədə işıqlandırmaqdır. Bəllidir ki, ərəblər Qədim Şərq və antik dövr sivilizasiyalarının ənənələrini mənimsəyib müəyyən qədər dəyişdirmiş və Avropaya tanıtdırmışlar, bununla da Dirçəliş dövrü Avropasının mədəni yüksəlişinə təkan vermişlər. “Məhz ərəblərin vasitəsilə Avropa ilk dəfə antik və şərq elminə-fəlsəfəsinə, riyaziyyatına, astronomiyasına, təbabətinə və i.a.qovuşmuşdur”[1]**.** Müsəlman mədəniyyətinin təməl müddəası, dəyişilməz prinsipi Allahın birliyi, təkliyidir. Qaynaqların təsdiqinə görə, Məhəmməd yeni dini yaradarkən ona xristian dininin bəzi elementlərini dəyişdirilmiş formada daxil etmişdir. Beləki, çoxsaylı ərəb qəbilələrinin hər birinin öz allahı var idi və onların öz allahlarına (bütlərinə) sitayişi hər yerdə və hər an mövcud olan rəhmli, bütün aləmlərin yaradıcı olan tək və uca Allah inancının qəbul edilməsinə mane olurdu. Amma, Ərəbistanda Məhəmmədə yaxud İslamaqədər musəviliyin və isaviliyin təsirinə məruz qalmış çoxsaylı hənifilər-monoteistlər var idi. Onlar da yahudilər və xristianlar kimi çoxallahlığı və bütlərə sitayişi rədd edir, allahın təkliyinə inanırdılar. Odur ki, bir çox tədqiqatçılar İslam dininin hənifəliklə əlaqəli olduğunu təsdiq edirlər.[2]

Quran İslam dininin və bütün müsəlmanların müqəddəs kitabıdır. Orada İslam inancının banisi Məhəmməd peyğəmbərin vəhyə dayanan moizələri yaxud xütbələri toplanmışdır. Müsəlman ilahiyyatçı ənənələrə görə, Quran Məhəmməd peyğəmbərə Cəbrayıl vasitəsilə vəhy formasında Allah tərəfindən göndərilmiş, peyğəmbər isə ilahi vəhiyləri qəbilə qardaşlarına öz moizələrilə çatdırmışdır. Peyğəmbərin vəfatından (632) sonra, onun ilk varisləri (pak) xəlifələr adlandırılmış Abu Bəkr və Ömər Məhəmməd peyğəmbərin tərəfdarlarından biri olan və peyğəmbərin moizələrini əzbər bilən Zeyd ibn Sabitə onun moizələrini yazmağı tapşırdılar. Üçüncü xəlifə Osman (644-656-cı illər) Quranın vahid redaktəsinin tərtib edilməsinə, qalın yazıların isə məhv edilməsinə sərəncam verdi. Bu sərəncama əsaslanaraq, Zeyd ibn Sabit özünün topladığı materialları məhv edilməmiş yazılara və peyğəmbərə yaxın olmuş və onun moizələrini dinləmiş bəzi məkkəlilərin təsdiqlərinə istinad edərək tamamlanmış və Quranın redaktə olunmuş son mətni qanuniləşmişdir. Zeyd bütün kitabı 114 surəyə bölmüşdür və onları həcmlərinə görə yerləşdirmişdir.

Müsəlman ənənələri surələri “Məkkə” surələri (peyqəmbər 622-ci ilə qədərki vahyə əsaslanan

moizələrə) və "Mədinə" surələrinə ayırır. Quranda müsəlman dini ehkamlarının sistemli şərhi yoxdur, yeni dinin yalnız əsas müddəaları yazılıb ki, bunları sonradan müsəlman ilahiyyətçiləri izah və şərh etmişlər. Məhəmməd peyğəmbər xüsusi savad sahibi olmasa da yeni dinin yaradıcısı və əqidəli carçısı, istedadlı siyasətçi və polemist idi. Onun təlimi qəbilə və tayfa mənsubluğundan asılı olmayaraq bütün insanlara yönəlmişdi və islamaqədərki ərəb ənənələrinə və ehkamlarına qarşı idi. Quranın bütün pafosu Ərəbistanın qəbilə-tayfa ictimai həyatının təsəvvür və əsaslarına (bütpərəstliyə, çoxallahlığa, qəbilələrarası mübarizəyə, qan düşmənçiliyinə) qarşı yönəlmişdi. Quranın bütün surələrində dünyanı və insanı yaratmış, adil və qüdrətli Allahın bütlərdən ucada durduğu təkrarlanır. Məsələn, Quranda deyilir: "Əlbətdə, doğru olan budur: Allahdan başqa heç bir tanrı yoxdur. Şübhəsiz ki, Allah yenilməz qüvvət sahibidir, hikmət sahibidir!".[3]

Məhəmməd peyğəmbər özünün moizələrində daim Allahın təkliyindən danışır. Peyğəmbərimizin yaxşı bələd olduğu xristianlıqdan fərqli olaraq İslamda Allah "doğan və doğulan deyil, şəriki yoxdur", həyata və ölümə yalnız O hökm verir, Onun istəyi və iradəsi olmadan bir yarpaq belə ağacdan düşə bilməz.

İslamda Allahın təkliyi şərtsiz qəbul edilir. Klassik islam filosof və yazarları Allahın təkliyini əsaslandırır və təsvir edirlər. Allahın təkliyinin İslam dünyasında təsviri o dərəcədə cəlbedicidir ki, hətta bir çox qərb filosoflarının da marağına səbəb olmuşdur. Məsələn, Hegel bununla bağlı yazır: "Əgər (işin faktik tərəfinə qayıdaraq) Təkin dərkini ... ona xas olan paklığında və ucalığında gözdən keçirmək istəyirlərsə islam dünyasına müraciət edilməlidir. Əgər, məsələn, kamil Cəlaləddin Rumidə ilk planda, xüsusi olaraq ruhun Tək ilə vəhdəti önə çəkilirsə və bu vəhbət sevgi kimi səciyyələndirilirsə, onda bu ruhi vəhdət sonlu və adi olan üzərində yüksəlişdən ibarətdir".[4]

İslamda antropomorfizm elementlərinə də rast gəlinir: Allah eşidir, görür, danışır, O əlini peyğəmbərin çiyninə qoya bilir və bu anda peyğəmbər Onun barmaqlarının sərinliyini hiss edir. İslam ilahiyyatçıları belə ifadələrin həqiqi deyil, məcazi olduğunu bildirmişlər. Lakin, bütün bu təsəvvürlərə baxmayaraq, İslamın ilk çağlarında peyğəmbər və onun məsləkdaşları, yəhudilərin etdiyi kimi ilahinin hər hansı maddi təsvirini bütpərəstlik kimi şərh edərək qadağan edirdilər. Elə buna görə də onlar öz allahlarının təsvir etdiklərinə, yəni təsviri sənətlərinə istinad edərək xristianları "bütpərəstlər"adlandırırlar.

Bəzi qərb müəllifləri peyğəmbərimizin təlimində teodits (Allaha haqq qazandırma) tezisinin olduğunu təsdiq edirlər. Bu tezisin mahiyyəti şərin insanın bütün davranışlarını öncədən müəyyənləşdirən böyük, arif, rəhimli və adil Allahın varlığı ilə bir araya sığmasının təsdiqindən ibarətdir. Bu teziz başqa dinlərdə olduğu kimi, İslam dinində də bir ziddiyət, yəni dünyada ilahi xeyirlə şərin biraraya sığmasının qeyri-mümkünlüyü məsələsini doğasına səbəb olmuşdu. Bu ziddiyyəti həll etmək üçün, sonradan bir çox müsəlman ilahiyyatçıları çox düşünmüşlər.

İncildə olduğu kimi Quranda da dünyanın Allah tərəfindən yaradıldığı bildirilir. Quranın Tövrat və İncillin bir-birinə zidd olmadığı, bəzi müddəalarının uyğunluğu Quranın özündə də təsdiq edilir. Məsələn, Bəqərə surəsinin 40-cı ayəsində deyilir: "Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi xatırlayın, (Tövratda axirüzzəman peyğəmbər barəsindəki) buyurduğumu yerinə yetirin ki, Mən də sizinlə (sizi Cənnətə varid etmək barəsində) olan əhdə vəfa edim. Yalnız məndən qorxun!". 41-ci ayədə isə fikir davam etdirilir: "Sizin əlinizdəki (Tövratı) təsdiqləyici kimi göndərdiyimə (Qurana) iman gətirin! Onu inkar edənlərin əvvəlincisi siz olmayın! Mənim ayələrimi (Tövratdakı hökmlərimi) ucuz qiymətə (dəyərsiz dünya malına) satmayın və ancaq məndən qorxun!".[5]

Lakin Tövratdan və İncildən fərqli olaraq Quranda yazılır ki, Allah bütün kainatı və insanı (yeri, ulduzları, bitkiləri, heyvanları və insanları) yalnız insanı sınağa çəkmək istəyilə yaratdı. Allah öz peyğəmbərləri (elçiləri) vasitəsilə insanları sınamaq üçün ona sitayiş, itaət etmək əmri verdi, sonra da layiq olanları mükafatlandırdı, itaət etməyənləri cəzalandırdı.

Digər peyğəmbərlər (Adəm, Nuh, Musa, İsa və b.) kimi Məhəmməd peyğəmbər də Allah və insanlar arasında vasitəçi idi, O heç vaxt özünün fövqəlinsan keyfiyyətlərə sahib olduğununu israr etmirdi, yalnız uca Allahın ona göndərdiyi vəhyləri insanlara çatdırdığını təsdiq edirdi, yalnız ilahi iradəyə uyğun olaraq ərəblərə Allahın birliyini və həqq olduğunu, xeyir və şəri fərqləndirməyi öyrədirdi, dəhşəti Məhşər, qiyamət gününün gələcəyini bildirirdi. "Mən sizə demirəm ki, Allahın xəzinəsi məndədir. Mən qeybi bilmirəm və sizə də demirəmki mən mələyəm. Mən yalnız özümə gələn vəhyə tabe oluram".[6] "Mən də sizin kimi bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız yalnız bir olan Allahdır".[7]Məhəmməd peyğəmbərin təsdiqinə görə, Allah bir çox peyğəmbərə əyan olmuşdu, amma, heç də onların hamısı onun sözünü düzgün anlamamışdı, bəziləri isə onu bilərəkdən təhrif etmişlər. Məsələn, yahudilər və xristianlar belə etmişdilər, ancaq sonuncu peyğəmbər Məhəmməd Allahın ona vəhy etdiyi sözləri düzgün anladı və əsl ilahi qanunu təkcə ərəblərə deyil, bütün bəşəriyyətə bildirdi və ona inananların xilas olacağını, iman gətirməyənlərin odda yandırılacağını xəbər verdi.

Müsəlman mədəniyyətinin bir çox qərb tədqiqatçıları bu fikirdədir ki, Məhəmməd peyğəmbərin təlimi

həqiqətin ilkin saflığında bərpası, həm də Allahın dərkində yüksək pillə kimi irəli sürülmüşdür, çünki bu təlim Allahın son sözüdür və Məhəmməd peyğəmbərin yaydığı din universaldır və bəşəriyyətin xilası üçün onun mümkün qədər geniş yayılması zəruridir. Xristianlar və yahudilərə gəlincə, onlar "yazı adamlarıdır", həqiqət təsəvvürlərində təhrifçilik olsada, hər halda Allahın diktə etdiyi qanunla yaşayırlar, ona görə də qurtuluşa ümüd edə bilərlər, amma yalnışlıqlardan qurtatmaq üçün onlarında yeni inancı qəbul etmələri arzu olunandır.

Qurani Kərimə görə, peyğəmbərlər Allahdan günahkarı bağışlamağı istəyə bilər, çünki özləri günahsızdır, yalan söz deməzlər, bəzən də möcüzə yarada bilirlər. Amma Məhəmməd peyğəmbər hər hansı bir möcüzə yaratmaqdan qəti imtina etmiş və bunu Quranın öz misiyasında heç bir sübuta ehtiyacı olmayan ən böyük möcüzə olduğunu deyərək əsaslandırmışdır. Bu fikri peyğəmbərin və onun məsləkdaşlarının hər hansı bir möcüzə yaratdığına dair məlumatın olmaması da təsdiq edir.

Lakin VIII əsrdə, müsəlman inancının təkamülü gedişində, xüsusilə xristian bidətçiləri təsiri altında Məhəmməd peyğəmbərin möcüzə yaradan obrazını formalaşdıran əfsanələr yaradıldı. Bu əfsanələr yeni inancın tərəfdarlarının şüurunda kök ataraq, Quran və surələr (hədislər) qədər orta əsrlər müsəlmanlarının mənəvi həyatının formalaşdırdı. Bu əfsanələrdən birində deyilir: Peyğəmbər Məkkədə ərəb qəbilələri qarşısında ordu başçılarının birinin əlsiz və ayaqsız qızına əlac elədi, Allaha dua etməklə qız sağaldı və gözəlləşdi. Başqa bir rəvayətə görə, Məhəmməd doğularkən damın üzərində işıq parladı və onun ən qatı düşmanlarından biri onu daşla vurmaq istədikdə qəsbkarın əlləri və ayaqları bədənindən qopdu.

Qaynaqlar bildirir ki, müsəlmanların inanca və mənəviyyata dair vəzifələri tədricən, bir çox illər ərzində formalaşmışdır. Peyğəmbər öz fəaliyyətinin ilk dövründə özünü Adəmə Allahın vəhy yolu ilə göndərdiyi "xalis inancın" bərpaedicisi və dəyişdiricisi adlandırmış, ona şərabın da içilməsinin qadağan olduğunu əlavə etmişdir.

Məhəmməd peyğəmbərin hələ Mədinədə tərtib etməyə başladığı müsəlmanların əsas vəzifələri bunlardır: hər bir müsəlman Allahdan başqa ilahın olmadığına, Məhəmmədin isə Allahın elçisi olduğuna inanmalıdır; gündə beş dəfə namaz qılmalıdır; kasıbların xeyrinə ictimai xəzinəyə üzvlük (zəkat) ödəməlidir; Ramazan ayında məscidə və Məkkəyə həcc ziyarətinə getməlidir.Müsəlman olmaq üçün müsəlman inancın simvolunu: "Mən təsdiq edirəm ki, Allahdan başqa ilah yoxdu və Məhəmməd Allahın elçisidir" kəlamını dilə gətirmək kifayətdir. Bununla yanaşı, müsəlman olmuş şəxs İslamın əsas tələblərini, xüsusilə namazı da yetirməlidir.

Müsəlman ilahiyyətçiləri peyğəmbərdən sonrada müsəlmanların xüsusilə bayram günlərində məsciddə namaz qılmasını vacib sayırdılar, göstərirdilər ki, cümə namazı İslama iman gətirənlərdə daha cox emosional təsir göstərir və intizama dəvət edir və onlara müsəlman birliyi aşılayır. Məsələn, müsəlman ilahiyyətçisi əl-Buhari deyirdi ki, "məsciddə qılınan namaz evdə yaxud iş yerində qılınan namazdan iyirmi beş dəfə üstündür". Müsəlman mədəniyyətində Məkkə ziyarəti də kifayət qədər vacib sayılır. Hesab edilir ki, bu mürəkkəb ritual dini hissi gücləndirir.

Müsəlmanlarda inanc yaradılmışdır ki, müqəddəs şəhərə, xüsusən də Kəbəyə ziyarət xəstəliyi sağaldır və bu gün də on minlərlə insan Kəbəyə əlini toxundurmaq, qara daşı öpmək və möcüzəli zəmzəm suyundan içmək üçün bu müqəddəs sayılan şəhərə axışır. Qaynaqlar göstərir ki, Məkkə ziyarəti islamaqədərki Ərəbistanda necə idisə o cür də saxlanmışdı, amma ziyarətçilərin qədim bütpərəst hərəkətləri İslam ruhunda təsvir edilmişdir. Rəvayətə görə, Məhəmməd peyğəmbər Kəbədə olan bütləri sındırmış, ancaq məbədin qara daşını müqəddəs elan etmiş və qail müsəlmanların bundan sonra ona sitayiş etməsinin vacib olduğunu bildirmişdi.

Müasir dövrdə digər ənənələr də saxlanmışdır. Müsəlman ziyarətçiləri Məkkəyə daxil olarkən ağ parça ilə örtünməli, kişilər bığlarını qırxmalı, dırnaqlarını kəsməli, başlarına araqçın qoymalı, çimməlidirlər. Məkkəyə qələrkən onlar ilk sırada Kəbə məbədinə gedib alınlarını Qara daşa söykəməlidirlər, yeddi dəfə məbədin başına dolandıqdan sonra, zəmzəm quyusuna yaxınlaşıb sudan içməlidirlər. Sonra, ziyarətçilər Adəm və Həvvanın günah işlətdikdən sonra tövbə etdiyi Ərəfat dağına qalxmalıdırlar. Ziyarətin onuncu günü ziyarətçilər İbrahimin öz oğlu İsmailı qurban kəsmə istədiyi Mina vadisinə yollanıb şeytana daş atmalı və İbrahimin xatirəsi qurban kəsməlidirlər. Bəzi müəlliflərin fikrincə, "həcc mərasimində bütpərəstlik ənənələri və İncil-Quran mifologiyası çulğaşır".[8]

Yeni dini yaradarkən, peyğəmbər, yalnız Allah iradəsinin ifadəcisi kimi çıxış etmişdi, həm də yaranmaqda olan müsəlman dövlətinin başcısı idi. O öz fəaliyyətində dini başçılığı və dünyəvi siyasi rəhbərliyi birləşdirmişdi. Teokratik dövlət ideyası peyğəmbərin ilk tərəfdarlarının (ümmətlərinin) müsəlman icma-dövlətini yaratmasında ifadə olunurdu. Dua zamanı başcı funksiyasını, yeni dinin carçısı və qanunvercisi funksiyasını yerinə yetirən peyğəmbər, həm də ilk müsəlman dövlətinin ali baş komandiri və siyasi rəhbəri (əmiri) idi. Lakin onun həyatı icma üzvlərinin həyatından heç nə ilə fərqlənmirdi: çadırda

yaşayır, başqa müsəlmanlar kimi geyinirdi, onlarla birlikdə yeyirdi. Mədinə surələrin birində müsəlmanlara xüsusi zərurət olmadıqda peyğəmbəri narahat etməmək tövsiyə edilirdi. Peyğəmbərlik məşğuliyyətindən kənarda Məhəmməd adəti üzrə qəbilə başcısı-said olurdu.

Həyata keçmiş tədqiqatlar təsdiq edir ki, Məhəmməd Peyğəmbərin moizələrini ilk müsəlmanlar həyəcanla dinləyirmişlər və onun peyğəmbərliyinin gözəl sübutu kimi qəbul edirmişlər. Onun moizələrinin emosional təsir gücü onların poetik çəkiciliyi və üslub xüsusiyyətilə bağlı idi. Lakin zaman keçdikcə peyğəmbərin moizələrinin üslubu dəyişilmiş və Mədinədə etdiyi moizələri əvvəlki ilhamda səslənmirdi. Peyğəmbər Mədinə surələridə, artıq yeni təlimin əsas müddəalarını formula etməyə, yaranan müsəlman icmasına dövlət hüquq normaları vermək istəyən qanunverici kimi çixiş edirdi. Bu surələrdə O, coşdun peyğəmbərdən çox, dini və siyasi qaninverici kimi canlandırılır. Amma Mədinə surələri heç də əvvəlki poetik ruhdan məhrum deyildi.

**Ədəbiyyat:**

1. Филиштинский И.М., Шидвар Б. Очерки арабо-мусульманской культуры. Москва 1976., с. 10
2. Yenə orada, s.36.
3. Qurani Kərim 3/62. Bakı; “ Qismət”, 2001, s.31
4. Hegel. Ruh fəlsəfəsi (çevirəni A.Tağıyev) Bakı-2003.
5. Qurani Kərim. Bakı, Qismət. 200, s.4
6. yenə orada 6,50, s.71
7. yenə orada, 18, s.110
8. Филиштинский И.М., Шидвар Б. Очерки арабо-мусульманской культуры. Москва 1976. , с. 49

**Priorities that make the basis of islamic culture**

**Summary**

The article is dedicated to the relevance of researching Islamic culture and its fundamental features. The author also investigated the advantageous similarities and differences and its dialogue with other religions. The role some elements and factors in the gradual formation of Islamic culture is other investigated point in this article. Also, minds of oriental and west investigations about Islam culture were shown in this article. Also, elements of culture of VII-XII centuries was considered.

The unchanging principle of Islam culture – the principle of monotheizm, problems of the create human and universe was investigate in this article.

**Важные факторы, определяющие основы исламской культуры**

**Резюме**

В настоящей статье говорится об актуальности изучения культуры Ислама. Исследуются основы Исламской культуры, ее диалог с различными иными культурами, показаны её некоторые преимущества, а также сходства и различия, существующие между ними. Также освещается вопрос роли некоторых элементов, факторов на постепенное формирование исламской культуры. В статье также был проведён сопоставительный анализ мыслей об Исламской культуре учёных запада и востока. Здесь также были рассмотрены элементы периода расцвета Исламской культуры VII-XII веков, когда она приобрела мировое значение.

**Rəyçi: dos. B.Quluzadə**

## ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ

**Золина Нигяр Чингиз гызы**
Самарский государственный социально-педагогический университет

# Ф. КАФКА. «РЕАЛЬНОСТЬ И АБСУРД» НАШЕЙ ЖИЗНИ

***Ключевые слова:*** *Франц Кафка, новеллы, роман, пессимизм, немецкая литература*
***Açar sözlər:*** *Frans Kafka, novella, əsər, pessimizm, alman ədəbiyyatı*
***Key words:*** *Franz Kafka, novel, literature, pessimism, German literature*

Франц Кафка один из самых талантливых писателей современности. Появился на горизонте немецкой литературы в начале 20-х годов XX века, его творчество до сих пор вызывает немало споров и сомнений. Но абсолютно все исследователи сошлись на одном, что Ф. Кафка смог раскрыть глубокую депрессию, бездуховность, также показал кризис общества 20 века. Затронул множество проблем, которые и сегодня актуальные.

Главной характерной чертой произведений Ф. Кафки – это пессимистичный и трагический взгляд на жизнь, а человек представлен как жертва судьбы. Такой взгляд, обусловлен влиянием, модных немецких философов. Ф. Ницше сыграл большую роль в становление Кафки как писателя, но сильнее всего на автора влияли условия его собственной жизни. Франц родился и прожил всю свою жизнь в Праге. Так как в то время Чехия была в составе Австро-Венгерской империи, поэтому в семье говорили по-немецки, хотя мать знала ещё и чешский. В обстоятельствах такой страной обстановке. В миксе национальных культур, еврейской, немецкой австрийской, чешской, рос еврейский мальчик, у которого формировалось ощущение какой-то промежуточного существования. А Ф. Кафка имел очень тонкую душевную натуру, он был не защищён перед внешним миром, боялся перемен, не мог приспособиться к изменениям, поэтому испытывал постоянный страх перед жизнью и испытывал чувство вины перед людьми и жизнью. Конечно он мог бы, использовать способ, которыми пользовались в 19 в. Отгородиться от жизни и творить, жить в иллюзиях, жить и верить в свое исключительность, но Кафка так не мог. Например, его современник Р. М. Рильке, популярный австрийский поэт, очень плохо относился к городу, осуждал его влияние на личность, а спасение видел в гармонии человека со вселенной и с Богом. Но Кафка, вообще, не видел никакого спасения. Он считал, что человек одинок, предназначен для страданий и мук – это и является всем составом его жизни. Все о чем когда-либо мечтал Кафка – это тихо заниматься писательством, чтобы никто не мешал и не притязал его, а ежедневная рутина, например, вставать, ходить на работу, общаться с людьми очень сильно утомляли Франца. Но материально, такое позволить себе он не мог. Особенности перед своим отцом. Отец был владельцем небольшой фирмы и конечно, же хотел видеть в своём сыне успешного юриста и достойного наследника семейного наследия. Конечно это очень отразилось на его творчестве.

Произведение «Письмо отцу», которое было написано в очень личной форме, в последствие получило очень большую известность, как вечная проблема «отцов и детей». Разбирая в письме систему воспитания, Франц, писал: «Тем самым мир делился для меня на три части: один мир, где я жил, подчиняясь законам, которые придуманы только для меня и которые я, неведомо почему, никогда не сумею полностью соблюсти; в другом мире, бесконечно от меня далеком, жил Ты, повелевая, приказывая, негодуя по поводу того, что Твои приказы не выполняются; и, наконец, третий мир, где жили остальные люди, счастливые и свободные от приказов и повиновения. Я все время испытывал стыд: мне было стыдно и тогда, когда я упрямился— ибо как я смел упрямиться по отношению к Тебе! Не был в состоянии выполнить их, потому что не обладал, например, ни Твоей силой, ни Твоим аппетитом, ни Твоей ловкостью, а Ты требовал всего этого от меня как чего-то само собой разумеющегося. Это, конечно, вызывало у меня наибольший стыд. Так складывались не мысли, но чувства ребенка»[1]. Свое письмо, писатель, так и не отправил своему отцу, но их описал так: «Стало быть, мир состоит из тебя и меня»[2]. В этом письме показаны совершенно противоположные чувства мягкого, погрязшего в творчестве и жёсткого, принципиального, волевого и деспотичного отца, который не понимает таланта и уникальности своего сына.

В течение своей жизни, Кафка смог издать только сборники рассказов, а вот романы, которые были даже не окончены он не только не стал публиковал, но даже попросил своего друга Макса

Брода, сжечь их после его смерти вместе с другими его произведениями, дневниками и набросками. Его друг не смог выполнить его напутствие и издал целых 9 томов произведений Кафки. В любых его историях, в центре сюжета оказывается одинокий, непонятный герой, который попадает или живёт в фантастической реальности. Например, как Карл, герой недописанного романа «Пропавший без вести», который был опубликован под названием «Америка». За небольшую провинность, родители сослали Карла из любимой Праги в далекую и неизведанную Америку, где парня на каждом шагу поджидали неприятности и разочарования. Странности судьбы подводят героя к неутешительному выводу: человек безгранично одинок и в своем одиночестве не способен противостоять всесильному житейскому злу и несправедливости. Почти такой же герой фантастического и загадочного романа «Процесс», Йозефа К., арестовали какие-то неизвестные люди, а приговор вынес таинственный и всесильный суд, который официально и не существовал или, скорее всего, существует неофициально. В течение всего романа происходит фантастический процесс, а в центре обсуждается и обсуждается человеческий грех, его не идеальность и из-за этого его и судят. Герои Кафки погружены в себя и мало, можно сказать, вообще не интересуются миром, но все рано чувствуют за это свою вину. Герои, Кафки виноваты уже потому что, что существуют и живут. И приговор никто и никогда не отменит, это – его рок!

Чувство чины, которые ощущают как герои, так и сам автор(перед своим отцом, друзьями, семьёй, знакомыми) – самый сильный у писателя. И в рассказе «Превращение» самая сильная метафора этой проблемы. Кафка любил отца, восторгался им и в тоже время ненавидел и не понимал его, постоянно находился в конфликте с ним. Именно это отношение и показаны в рассказе.

Д.Затонский писал: «наряду с поисками высшей справедливости и индивидуального закона, Й.К. подвергается и суду объективному, обладающему приметами социума, ибо «…» И.К.— часть враждебной ему самому действительности, и это делает его «нечистым» в собственных глазах, вызывает все усиливающееся чувство вины. Оттого он не может уйти от суда, хотя суд его не держит»[4].

Ненавистную реальность автор пропускал через себя, сравнивал с личным опытом и чувствами внутреннего мира и именно это реально показывает всю безысходность и нелепость и реальность этого мира. Наверное, справедливое и честно сказала женщина, которую Кафка любил, они познакомились незадолго до его смерти, но все равно он так и не смог связать с ней свою жизнь. Она была чешской журналисткой Милена Есенская. Как то Милена написала Максу Броду: «… я думаю… для него жизнь вообще — нечто решительно иное, чем для других людей, и прежде всего деньги, биржа, валютный банк, пишущая машинка для него совершенно мистические вещи… Для него служба — в том числе и его собственная — нечто столь же загадочное и удивительное, как локомотив для ребенка… Он абсолютно не способен солгать, как не способен напиться. У него нигде нет прибежища и приюта. Он как голый среди одетых… Человек, бойко печатающий на машинке, и человек, имеющий четырех любовниц, для него равно непостижимы… непостижимы потому, что они живые. А Франц не умеет жить. Франц не способен жить. Франц никогда не выздоровеет, Франц скоро умрет»[3]. Это было правдой, писатель очень сильно переживал из-за своего неумения налаживать нормальные отношения с окружающей средой. Его съедало постоянное чувство вины за то, что он не соответствует требованиям, которые окружающей мир предъявляет человеку. Он был человеком, который очень часто встречается среди художников, которые всегда находят причины своего одиночества и недовольству миром. Это показывает несправедливость, несовершенство мира и враждебность к человеку, такой способ использовали реалист именно это и являлось главной проблемой страдания личности. Если бы творчество Кафки пестрило только самобичеванием, только размусоливание личных комплексов, то оно никогда и никому не было нужно и никогда не получило бы такой мировой резонанс. Его страхи и комплексы выливались в кошмары и фантасмагорию, которая порождала его больная фантазия, воплощённые как в маленьких новеллах, так и в не законченный романах, которые как показало время, даже в пророческих.

Страшные годы второй мировой войны, сталинские и гитлеровских лагерей пропитали их смыслом, какое Ф. Кафка даже не думал вкладывать и вряд ли бы смог предположить. Но все равно, после его кончины о нем стали говорить как о современном пророке. Произведения, Ф. Кафки, исследуется критиками, учеными во всем мире, их обсуждают, им посвящённые огромное количество статей, трактатов. В разных странах и разное время их запрещали, её переводили, как и не издавали. Но сейчас творчество Кафки оценено по достоинству и в художественном мире его произведения являются одной из вершин европейского модернизма.

**Литература:**

1. Ф. Кафка: «Письмо отцу» // http://book-online.com.ua/read.php?book=4713&page=3
2.http://iessay.ru/ru/writers/foreign/k/kafka/stati/zhizn-i-tvorchestvo-poeta/interesnye-podrobnosti-zhizni-i-tvorchestva-f.-kafki
3. Грета Ионкис (Кельн): http://inter-focus.de/?p=1532
4.https://ser-esenin.ru/sochineniya-vse/harakteristika/3052-sochinenie-na-temu-yozef-kproizvedenie-process.html

**F.Kafka. Həyatımızın "Reallığı və Mücərrədi"**
**Xülasə**

F. Kafka dərin bir depressiyanı, mənəviyyatın çatışmazlığını ortaya qoya bildi, eləcə də 20-ci əsr cəmiyyətinin böhranını da göstərdi. Bu gün də aktual olan bir çox problemlərə toxundu.

F. Kafkanın əsərlərinin əsas xarakterik xüsusiyyəti həyata pessimist və faciəvi baxışdır, insan isə taleyin qurbanı kimi təqdim olunur. Bu görüş dəbli Alman filosoflarının təsiri ilə bağlıdır. O hesab edirdi ki, insan tənhadır, əzab və əziyyətlər üçün yaradılmışdırmışdır - bu onun həyatının bütün tərkib hissəsidir.

**F.Kafka. "Reality and absurdity" of our life**
**Summary**

F. Kafka was able to reveal a deep depression, lack of spirituality, also showed a crisis of society of the 20th century. He touched on many problems that are still relevant today.

The main characteristic feature of the works of F. Kafka is a pessimistic and tragic outlook on life, and a person is presented as a victim of fate. This view is due to the influence of fashionable German philosophers. He believed that a man is lonely, created for suffering and torment - this is the whole composition of his life.

**Рецензент: проф. Е.В.Абрамовских**

**Yaqubova Cahidə Etibar qızı**
Azərbaycan, Bakı
ccahide@bk.ru

# XIX ƏSR AZƏRBAYCAN AŞIQ YARADICILIĞI

***Açar sözlər:*** *aşıqlıq, məclislər, ustad, dastan, səfər*
***Key words:*** *ashug's creativity, mejlises, master, dastan, travel*
***Ключевые слова:*** *ашугство, меджлисы, мастер, дастан, путешествие*

## GİRİŞ

Aşıq yaradıcılığının çox qədim tarixi vardır. XIX əsrdən başlayaraq aşıq şeiri və musiqisi inkişaf etməyə başlayır. Bu, sazda simlərin nizamlı düzülüşü, üç müstəqil səs axarının olması ilə əlaqəlidir. Aşıq sənəti oğuz və türk tarixi mədəni mərhələlərinin analoji sənət hadisələri əsasında yaranmışdır. Azərbaycanda dastançılar, ozanlar qədim zamanlardan mövcuddur. XVI-XVII əsrdən başlayaraq onlar aşıq adlandırılmışlar.

Cavan aşıqlar aşıq ədəbiyyatına yeni hava, insana məhəbbət, zəhmətə yeni münasibət gətirirlər. Ustad aşıqlar aşıqlıq sənətini hər zaman uca tutmuş, ona ləkə gətirmək istəyənlərə qarşı mübarizə aparmışlar.

## XIX ƏSRİN AŞIQLARI VƏ AŞIQ YARADICILIĞININ XÜSUSİYYƏTLƏRİ

Çox qədimlərdən yaşayan aşıq ədəbiyyatı XIX əsrdə yeni keyfiyyətlər ilə zənginləşir, yeni qoşmalar, dastanlar, aşıq havaları yaranır. Bu dövrdə ustad aşıqlar yetişir. Kəskin tənqid və satira məhz XIX əsrdə güclənərək xüsusi mövqe qazanır. Yazılı ədəbiyyatda yaranan satira aşıq ədəbiyyatına təsir edirdi. Klassik aşıq ədəbiyyatında özünü göstərən üsyanın, şikayətin və iniltinin yerini həcv və tənqid tutur. Aşıq ədəbiyyatındakı tənqidlər, həcvlər və satiralar yazılı ədəbiyyatda olduğu kimi özbaşınalığa, yalana, zülmə, ictimai bərabərsizliyə qarşı idi. Buna görə də XIX əsrdə bəzi aşıqlar yuxarı təbəqələr tərəfindən təqib edilirdi. Təqib edilən aşıqlardan biri də Aşıq Mahmud olmuşdur. O, kəndlilərin ağır vəziyyətini, vergilərdən təngə gəldiklərini şeirində dilə gətirirdi:

Neçə nəfər məafların əlindən.
Biz fağırlar zarə gəldik günbəgün.

Aşıq Əhməd yerli feodallara, çar üsuli-idarəsinə yazdığı şeirlərə görə qardaşı ilə birgə qaçaq düşmüşlər, lakin sonda qardaşı ilə birlikdə öldürülürlər. XIX əsr aşıq ədəbiyyatı bir sıra xüsusiyyətləri ilə səciyyələnir. Bu dövrdə hətta qadın aşıqlar yaşayıb yaradırlar. Qadın aşıqların bəzisinin şeirləri, mahnıları dövrümüzə kimi gəlib çatmışdır. İlk qadın aşıq sənətkarı kimi adını ucaldan Ağabəyim ağa olmuşdur. O, “Ağabacı” imzası ilə şeirlər yazırdı. Qarabağ xanı İbrahim xan Cavanşirin qızı Ağabəyim ağa Tehrana, Fətəli xana ərə getmişdir:

Mən aşığam Qara bağ,
Qara salxım, qara bağ,
Tehran cənnətə dönsə,
Yaddan çıxmaz Qarabağ.

Ağabəyim ağa saray həyatı yaşasa da, orada özünü xoşbəxt hiss etməmişdir. Onun Qarabağ üçün, eli-obası üçün nə qədər darıxdığını, sevdiyini bayatılardan, şeirlərindən duymaq olur.

Aşıq Bəsti, Zeynəb, Püstə, Fatma, Aşıq Pəri, Mahtab xanım, Mahxanım və bir çoxları XIX əsrdə yazıb yaratmış qadın aşıqlarımızdır. Onların şeirlərində Azərbaycan qadınlarının taleyi, arzu və istəkləri, dünyagörüşləri əks olunur. Qadın aşıqlar içərisində aşıq Bəstinin həyatı və yaradıcılığı daha çox diqqət çəkir. Aşıq Bəstini ədəbiyyat aləminə tanıdan S.Paşayev olmuşdur. Onun haqqında xalq içərisində əfsanələr dolaşırdı. “Bəsti və Çoban” adlanan bu əfsanədə aşıq Əyyub adlı bir çobanı sevmiş, Yanşaq bəy isə çobanı öldürmüşdür. Bu ölüm Aşıq Bəstini çox sarsıtmış və hər zaman sevdiyi şəxsi xatırlamışdır. Ömrünün sonlarına yaxın kor olduğu üçün “Kor Bəsti” adı ilə tanınmışdır.

Şifahi ədəbiyyatla yanaşı aşıqlar tərəfindən yaradılmış əsərlər də XIX əsrdən başlayaraq nəşr edilir. Xüsusilə də Rusiyanın Azərbaycanı işğal etməsiylə ziyalıların folklor nümunələrinə marağı daha çox artır. Folklor nümunələri ilə maraqlanan alimlər və yazıçılar Zaqafqaziyaya gedərək folklor nümunələrini toplayıb çap etdirirdilər.

XIX əsr aşıqlarının dünyagörüşlərində müəyyən dönüşlər əmələ gəlirdi. İctimai məzmunlu çoxlu qoşmalar, şeirlər yazılırdı. Əsasən, aşıqlar zəhmətkeş xalq içərisindən çıxır, şeirlərində zəhmətkeş xalqı tərənnüm edir, xalq ilə birlikdə həm ağlayır, həm gülürlər. Xalqdan təcrid olunan aşıq yoxdur. Aşıqların bəzisi köhnə şeir formasını təkmilləşdirərək yeni məzmunlu şeir forması yaradırlar. Bu sıraya Aşıq Ələsgər, Şəmkirli Aşıq Hüseyn, Dilqəm, Aşıq Musa kimi ustad sənətkarlar daxildir.

Ustad sənətkarlar aşıqlıq sənətini kobudcasına pozanlara, hörmətdən salanlara qarşı daim güclü mübarizə aparmışlar. Digər zamanlarda olduğu kimi, XIX əsrdə də bu mübarizə kəskin şəkildə davam edirdi. Aşıq Ələsgər 1875-ci ildə yazdığı "Gərəkdi" şeirində "aşıq kimə demək olar" məsələsini aydınlaşdırır və aşıqların qarşısında bəzi vəzifələr qoyur.

Aşıqların adını alçaldanlara qarşı mübarizə edənlər sırasında Molla Cuma, Aşıq Vəli, Aşıq Musa da var.

Bəzi savadlı el şairləri qəzəllər, qəsidələr, mərsiyələr yazır, ifaçı aşıqlar, xanəndələr vasitəsilə xalq arasında yayırdılar. Lakin bunu da qeyd etmək lazımdır ki, el şairlərinin qəzəl və qəsidələri, mərsiyələri aşıq sənəti ilə uyğunluq təşkil etmədiyindən müvəffəqiyyət əldə edə bilmirdi.

Mətbuatın çox inkişaf etmədiyi dövrlərdə aşıq yaradıcılığı məhəlli xarakterli idi. Yəni Şirvan aşıqlarının əsərləri Şirvan mahalında, Kəlbəcər aşıqlarının əsərləri Kəlbəcər ətrafında geniş yayılırdı.

Aşıq ədəbiyyatında hansısa aşığın şeirinin başqa aşığın adına getməsi halları çox olurdu. Deyilənlərə görə, Aşıq Əsədin hesab edilən "balaca qız", "malades" qoşmaları əslində Aşıq Ələsgərə aiddir.

Aşıq yaradıcılığında məhəbbət mövzusu da əsas olmuşdur. Şeirlərində ülvi məhəbbət, mənəvi saflıq kimi mühüm insani keyfiyyətlər təbliğ edilirdi. Lirik qəhrəman həqiqəti sevən real insandır, onun iztirabları, saf məhəbbəti qabarıq şəkildə göstərilir. Aşıq yaradıcılığına xas olan nikbin ruhlu qəhrəman məhəbbət yolunda çəkdiyi iztirablardan sanki yorulmur, vüsala çatmaq ümidini itirmir.

Qədimlərdən XIX əsrə qədər xalq-aşıq şeir şəkli olan "bayatı" ən geniş istifadə olunan formalardan olmuşdur. Bayatı janrı qədim şeir şəkli kimi aşıqların, el şairlərinin yaradıcılığından keçir. Əvvəllərdə olduğu kimi aşıqlar yenə də iki qismə bölünürdü:

1) yaradıcı-ustad aşıqlar
2) peşəkar-ifaçı aşıqlar

Yaradılan dastanlar məzmununa və formasına görə ötən illərdə yaranan dastanlardan xeyli fərqlənir. Belə ki, artıq dastanlar həcimcə yığcam idi və "səfər"lər şəklində meydana çıxırdı. Bu baxımdan "Çoban Məhəmmədin Qars səfəri" , "Aşıq Hüseynin Naxçıvan səfəri" , "Aşıq Alının Türkiyə səfəri" nümunələrini demək olar.

Bəstəkar aşıqlardan Qazaxlı Zülfüqar "Qazax dubeytisi" , "Qazax səbzəsi" saz havalarını yaradır. Başqa bir bəstəkar aşıq isə Sallı Cəlilovdur. O da "Orta Cəlili" , "Ayaq Cəlili" kimi saz havaları yaradır. Eyni zamanda XIX əsrdə "Dilqəmi", "Göyçə gülü" , "Aşıq Hüseyni" kimi saz havaları meydana çıxır.

XVI-XVIII əsrlərdə olduğu kimi hətta XIX əsrdə də klassik aşıq sənəti ilə bərabər, ozan yaradıcılığından da müəyyən qədər istifadə edilirdi. "Aşıq Alının Türkiyə səfəri" dastanı "Dədə-Qorqud" dastanının "Bamsı Beyrək" boyundan, "Aşıq Hüseynin Naxşıvan səfəri" isə Aşıq Valehin dastan yaradıcılığından təsir və güc almışdır.

Xan Tahirin, Qurbaninin, Abbas Tufarqanlının, Şah İsmayılın tərənnüm etdiyi elə dağlar, yer adları vardır ki, biz onları tanımırıq, bəzisində isə konkret ünvan yoxdur. İstisna olaraq, aşıq poezisiyasında aydın təsvir və tərənnüm edilən adlar var:

Şəmşəddin elində, Tovuz çayında,
Gözüm bu gün bir dildara düşübdür.

Ayrı-ayrı bölgələrdə fərqli adlarla aşıq məclisləri yaradılmışdır. Onlardan bizə məlum olanları "Dilqəm bulağı" və "Qurban bulağı" məclisləridir. "Dilqəm bulağı" Şəmkirdə, "Qurban

bulağı" isə Göyçə- Kəlbəcər bölgəsində fəaliyyət göstərirdi. Bu bulaqlar-məclislər Ağdabanlı Qurban və Yəhya bəy Dilqəmin adını daşısa da, daha çox Aşıq Ələsgər ilə Şəmkirli Aşıq Hüseynin sayəsində şöhrət əldə etmişdir.

## NƏTİCƏ

Aşıq yaradıcılığı hər zaman cəmiyyətin diqqət mərkəzində olmuş, dövrün problemlərini əks etdirmişdir. Aşıq poeziyasının yaradıcıları xalq sənətkarları yəni aşıqlardır. Şifahi ədəbiyyatın ən böyük qollarından biridir. XIX əsr aşıq yaradıcılığı yeni keyfiyyətlər qazanaraq inkişaf yolu keçir. Şeirlərdə məhəbbət, zülm, bərabərsizlik, mübarizə kimi motivlər öz əksini tapır. Hətta satira da bu dövrdə aşıq yaradıcılığında öz yerini tutmuşdur. XIX əsr aşıq yaradıcılarından Aşıq Məhəmməd, Aşıq Musa, Aşıq Mahmud, Molla Cümə, Aşıq Ələsgər, Həmayil, Pərnaz, Xaltanlı Tağı və bir çox sənətkarların adını çəkmək olar.

## Ədəbiyyat:

1. Nizami Xəlilov. Aşıq yaradıcılığı və yazılı poeziya, Bakı, Elm, 2012 .
2. Sədnik Paşayev. XIX əsr Azərbaycan aşıq yaradıcılığı, Bakı, 1990 .
3. Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər, Bakı, 2010.
4. Hüseyn İsmayılov. Aşıq yaradıcılığı: mənşəyi və inkişaf mərhələləri, Bakı, Elm, 2002 .
5. Azad Nəbiyev. Azərbaycan xalq ədəbiyyatı, Bakı, Elm, 2006
6. Paşa Əfəndiyev. Azərbaycan şifahi xalq ədəbiyyatı, Bakı, Elm və təhsil, 2015

## Azerbaijan Ashug's creativity in XIX century

## Summary

Ashug's creativity has always been in the spotlight of society, reflecting the challenges of the era. The creators of ashug poetry are folk artists, ie ashugs. It is one of the largest branches of oral literature. XIX century ashug creativity is on the way to development, acquiring new qualities. The poems reflect such motives as love, oppression, inequality, and struggle. Even satire has taken its place in Ashug's art during this period. Among the creators of the XIX century Ashug Mohammed, Ashig Musa, Ashig Makhmud, Molla Juma, Ashug Alesker, Hamayil, Parnaz, Khaltanli Tagi and many others.

## Азербайджанское ашугское творчество XIX века

## Резюме

Ашугское творчество всегда было в центре общественного внимания и отражало насущные проблемы эпохи. Создателями ашугского творчества являются ашуги. Ашугское творчество – это самый распространенный фольклорный жанр. В 19 веки это искусство обрело новые черты. Центральное место стали занимать такие мотивы как любовь, насилие, неравноправие, борьба и др. В этот период в ашугское искусство проникла также сатира. Среди известных ашугов того периода можно назвать имена Ашуга Магомеда, Ашуга Мусы, Махмуд, Моллу Джума, Ашуга Алескера, Гамаиля, Раназа. Халтанли Таги и др.

**Rəyçi: f.e.d. Ş.Cəlilova**

**Quluzadə Bəhram Əndəlib oğlu,**
Şamaxı Astrofizika Rəsədxanası
bahram.guluzade@mail.ru
**Salmanova Gülgəz Sabir qızı**
Bakı Slavyan Universiteti

# XX ƏSR AZƏRBAYCAN POEZİYASINDA ASTRONOMİK MOTİVLƏR

***Açar sözlər:*** *ulduz, planet, komet, lirika*
***Key words:*** *stellar, planet, comet, lyric poetry*
***Ключевые слова:*** *Звезда, планета, комета, лирика*

Ulduz elminin dəqiq yaranma tarixi məlum deyil. Görkəmli astrofizik İosif Şklovskinin qeyd etdiyi kimi, nəinki insanlar, eləcə də bir sıra digər canlılar da astronomik duyuma malikdir. Göy qübbəsi öz füsunkarlığı ilə insanları daim özünə çəkmiş, şairlərin ilham mənbəyi olmuşdur. XX əsr Azərbaycan poeziyası da bu baxımdan zəngindir.

Ölməz Mirzə Ələkbər Sabir öz satirasına astronomik notlar əlavə edir [1]:

Düz yeri bir yupyumuru şey sanır,
Həm də deyir sutkada bir fırlanır.
Göy dayanır, ay dolanır, gün yanır,
Kafirə bax, gör nə bədimandı bu,
Dur qaçaq, oğlum, baş ayaq qandı bu!

"Şərqin Şekspiri" adlandırılan Hüseyn Cavidin yaradıcılığında da sonsuz Kainat bütün incəlikləri ilə canlanır [2]:

Mən fəqət hüsn-xuda şairiyəm,
Yerə enməm də, səma şairiyəm!

Monumental şairimiz Səməd Vurğunun şeir və poemalarında sirli-soraqlı dünyanın poetik mənzərəsi verilir [3]:

Ayazlı-şaxtalı o qış axşamı
O ay dediyimiz göylərin şamı
O qarlı düzlərə baxıb yanırdı,
Yolçular getdikcə yol uzanırdı.

Xalq şairi Məmməd Araz öz poeziyasında astronomik çalarlar işlədir[4] :

Məndən soruşanda sən kimsən, onda
Nəsimi oluram alov donunda.
Bəzən üfüq adlə bir Nizamiyəm,
Deməк mən xilqətəm, demək hamıyam.
Bəzən Füzuliyəm, bir planetəm,
Bəzən bir ulduzam, bəzən kometəm.

Şairin "Azəri qızı" şeiri də bu cəhətdən maraqlıdır:

Dünya durulaşar ana səsindən,
Gör neçə illərdir onsuzam, gülüm.
Planet gözlərin cazibəsində
Yaşayan bir parça ulduzam, gülüm.

Ölməz şair Nüsrət Kəsəmənlinin lirikasında ulduzlu səma motivlərinə tez-tez rast gəlinir [5]:

Sanaram ki, dünyaya
İlk açılan səhərəm.
Ulduzları endirib
Yollarına səpərəm.
Başına dolanaram,
Əllərindən öpərəm,
Məni sevmədiyini
Bilsəm yalan deyirsən.

Dünyasını vaxtsız dəyişmiş Tahir Aslanlıda belə misralar var [6]:

Hara getdin, niyə getdin, nə üçün,

Bəlkələrim sığışmayır bir yerə.
Açılıram səhər kimi səninçün,
Ulduz olub çəkilirsən göylərə.

Şamaxı Astrofizika Rəsədxanasının alimləri içində də şeirə, sənətə meyl edənlər az olmayıb.

Elmlər doktoru Sabir Məmmədovun aşıq şeiri üslubunda yazdığı bir sıra maraqlı əsərləri var. O, əslən Güney Azərbaycandan olan astronom Ədalət Ətainin oğlu Təbrizin dünyaya gəlməsini "Toyunu Təbrizdə edək, Təbrizim!" – qoşması ilə salamlayıb:

Sənsiz keçirmişəm neçə qış, yazı,
Uca dağlar aşdım, gəzdim çöl-düzü,
Axırda Bakıda tapdım Təbrizi.
Gəl səni bağrıma basım , Təbrizim!
Yolunda qurbanlar kəsim, Təbrizim!

Yadima düşəndə fikrim dolaşır,
Könlüm tüğyan edir, huş başdan aşır,
Kürüm lərzələnir,Arazım daşır.
Gəl üzmə əlini məndən,Təbrizim!
Heç vaxt ayrılmaram səndən Təbrizim!

Bakı-Təbriz iki gözümdü mənim,
Qəlbimdən süzülən sözümdü mənim.
Cənub elimizə gedək, Təbrizim!
Toyunu Təbrizdə edək,Təbrizim!

Xalq şairi Söhrab Tahir bu şeirə başağıdakı bəndi əlavə etmişdir:

Yarı bölünərmi yaşayan bir can,
De, neyçün ikidi bəs Azərbaycan,
Anamız anamla birləşər haçan,
Cavab ver, ciyərim yandı, Təbrizim!
Sel kimi göz yaşım qandı, Təbrizim!

Ədalət Ətai deyir:

Hörmətli şairimiz Söhrab Tahir bu şeirə görə Sabir Məmmədova əhsən yazmışdır. Şeiri Sabir Məmmədov avtobusda yazmış və Bakıdan Şamaxıya çatanda mənə vermişdir. O mənim oğlumun adını Təbriz qoymağıma çox sevinmiş və ilhama gəlmişdir. Ona görə də üç saatlıq Bakı-Pirqulu marşrutu ilə gedən xidməti maşında bu şeiri hasil etmişdir.

Səma mexanikası üzrə görkəmli mütəxəssis, mərhum Rəhim Zeynalov da bədii yaradıcılıqla məşğul olurdu. O yazırdı:

Hanı ilham verən o dövran, büsat?
Hanı el havası Dilqəm, muğamat?
Rəhimin arzusu dərindir qat-qat...
İstər bəxt ulduzu – Ülkəri görsün.

Uzun illər Rəsədxanada işləmiş Musa Musayev də qələmini şeirdə sınayıb. Onun "Nurlu Günəş" adlandırdığı əsərində belə misralar var:

Göylərin sultanı, xəbərin varmı?
Sənin ulduzlardan xəbərin varmı?
Meteorlar ulduz-ulduz sürünür,
Göydəki izlərdən xəbərin varmı?

Kosmik uçuşlar, böyük astrofiziki kəşflərlə zəngin olan çağdaş dövrümüzdə astronomik çalarlarla boyanmış poeziya nümunələri xüsusi ilə böyük əhəmiyyət kəsb edir. Belə poetik incilər oxuculara yüksək bədii zövq verir, eləcə də onları Kainatın sirrləri üzərində düşünməyə səsləyir, böyüməkdə olan gənc nəslin təlim-tərbiyəsində əvəzsiz rol oynayır.

## Ədəbiyyat:

1. M.Ə.Sabir. Hophopnamə. "TURAN" nəşrlər evi, Bakı, 2002.
2. Hüseyn Cavid. Əsərləri. "Lider" nəşriyyatı, 2005.
3. Səməd Vurğun. Seçilmiş əsərləri. "Şərq-Qərb" nəşriyyatı, Bakı, 2005.

4. Məmməd Araz. Aylarım, illərim. Bakı, "Gənclik", 1978.
5. Nüsrət Kəsəmənli. Seçilmiş əsərləri. "Şərq-Qərb" nəşriyyatı, 2004.
6. "Çinar pöhrələri" ədəbi almanaxı. Bakı, "Gənclik", 1979.

**Astronomical motives in the Azerbaijan poetry of XX century**

**Summary**

The sky cupola gone always an inspiration to poets. Azerbaijan poetry of XX century also is rich with astronomical motives. Sabir, Javid, Vurgun and other masters of word extoled the sky of stellar. Some of Azerbaijan's astronoms also wrote poems about the cases of heaven. Poems about stars have special mean at our space time. Readers take a big pleasure from them. They call readers to think about secrets of Universe. Such works play special role in education of young people.

**Астрономические мотивы в азербайджанской поэзии XX века**

**Резюме**

Небесный свод всегда давал вдохновение поэтам. Азербайджанская поэзия XX века тоже богата астрономическими мотивами. Великие мастера слова Сабир, Джавид, Вургун и другие воспевали звездное небо. Некоторые азербайджанские астрономы тоже писали стихи о небесных явлениях. В нашем космическим веке стихи о звездах имеют особое значение. Читатели от них получают огромное удовольствие. Они призывают читателей задуматься о тайнах Вселенной. Такие произведения играют особую роль в воспитании молодежи.

**Rəyçi: f.f.d. F.Qurbansoy**

BEYNƏLXALQ MÜNASİBƏTLƏR INTERNATIONAL RELATIONS МЕЖДУНАРОДНЫЕ ОТНОШЕНИЯ

**Fərmanlı Ləman Afət qızı**
Azərbaycan Turizm və Menecment Universteti
rlferman9395@gmail.com

# ÇEXİYA- MƏŞHUR TURİZM DESTİNASIYASI KİMİ

***Açar sözlər:*** *turizm, iqtisadiyyat, müalicə, Çexiya*
***Key word:*** *tourism, economy, treatment, Czech Republic*
***Ключевые слова:*** *туризм, экономика, лечение, Чешская Республика*

**Giriş:** Səyahət və turizm dünyanın əksər ölkələrində mühüm iqtisadi fəaliyyətdir. Birbaşa iqtisadi təsiri ilə yanaşı sənaye əhəmiyyətli dolayı təsirlərə malikdir. Turizmin ÜDM-ə birbaşa qatqısı Milli Hesabatda da bildirildiyi kimi otellər, hava yolu şirkətləri, airpotlar, turizm agentlikləri və birbaşa məşğul olan əyləncə və rekreasiya xidmətləri kimi turizm xüsusiyyətli sektorlar vasitəsilə mümkündür [ 2,s.2].

**Cədvəl 1. Turizm və səyahətin iqtisadiyyata birbaşa qatqısı (2017)**

| Çex Respublikası (CZK mld, 2017) | 2012 | 2013 | 2014 | 2015 | 2016 | 2017 | 2018E |
|---|---|---|---|---|---|---|---|
| 1. Ziyarətçi ixracatı | 167.4 | 156.7 | 159.0 | 165.7 | 169.2 | 175.2 | 177.3 |
| 2. Daxili xərclər | 103.9 | 104.1 | 101.2 | 108.7 | 112.0 | 117.9 | 122.2 |
| 3. Daxili turizm istehlakı (=1+2) | 271.3 | 260.7 | 260.2 | 274.4 | 281.2 | 293.1 | 299.5 |
| 4. Turizm təminatçıları tərəfindən satınalmalar, idxal olunan əmtəələr daxil olmaqla | -152.8 | -146.5 | -145.0 | -152.8 | -156.3 | -162.7 | -166.5 |
| 5. Turizmin ÜDM-ə birbaşa qatqısı (=3+4) | 118.5 | 114.2 | 115.2 | 121.5 | 124.9 | 130.4 | 133.1 |
| 6. Digər təsirlər (birbaşa& dolayı) | 125.6 | 121.0 | 122.1 | 128.8 | 132.3 | 138.1 | 141.0 |
| 7. Kapital qoyuluşu | 38.7 | 36.4 | 36.9 | 48.2 | 45.6 | 46.8 | 47.2 |
| 8. Dövlətin işçi xərcləri | 27.7 | 28.2 | 28.4 | 29.3 | 30.1 | 31.4 | 32.0 |
| 9. Dolayı xərclərdən ixrac məhsulları | -20.4 | -17.0 | -19.0 | -16.3 | -16.2 | -16.7 | -17.3 |

***Mənbə:** Travel and Tourism Economic Impact 2018. Czech Republic. p 12.*

Ölkə Avropanın ən çox ateist inanclı vətəndaşları üzrə 2-ci pillədədir. Buna görə də kilsə və monstrlarla zəngin olan Çexiyada bu tikililər konsert zalı, muzey və oxşar məqsədlərlə istifadə edilir. 6-15 yaş arası təhsil məcburi olan ölkədə oxuyub yazmağı bilən əhali 99% təşkil edir. Çexiya ümumi olaraq güvənli və cinayət işlərinin azlığı ilə fərqlənməsi də turistlərin buraya marağını artıran amillərdən biridir.

Çexiyada olmaq orta əsr Avropa memarlığı və tarixi ilə tanışlıq üçün gözəl imkan deməkdir. Ölkə tarixi abidələri və muzeyləri ilə beynəlxalq turizmdə xüsusi şöhrət qazanıb. Ərazisində yalnız qəsr və qalaların sayı iki minə çatır. Ölkənin bir çox bölgələrində qorunub saxlanılan qədim tikililər Çexiyanı sehrli

istirahət məkanına çevirib. Bu gün Çexiya təbiət gözəllikləri həvəskarlarına istirahət və dinclik, ilin hər mövsümündə idmanla məşğul olmaq imkanı da təklif edir. Praqa, Çex Krumlovu, Kutna, Qora Telq kimi zəngin tarixə malik şəhərlər ölkəyə gələn qonaqlarda da böyük maraq doğurur. Çexiya Respublikasının paytaxtı Praqa isə əsl memarlıq salnaməsidir.Çexiyanın əsas turizm zonaları - Respublikanın paytaxtı Praqa, Qərbi Çexiya, Şumava dağları, Filizli dağları və Sudet bölgəsidir.

Ölkənin paytaxtı olan Praqa dünyanın ən məşhur destinasiyalarından biridir. Praqaya addımını qoyanda başa düşürsən ki, bu, turistlər şəhəridir. Praqanı çox vaxt "şəhərlər şəhəri" adlandırmaqla onun memarlıq və mənəvi zənginliyini və xüsusilə bənzərsiz cazibədarlığını vurğulamağa çalışırlar. Praqa tarixi-memarlıq abidələri, muzeylər, parklar, gözəl körpülər, yaraşıqlı meydanları olan dünyanın ən gözəl şəhərlərindən biridir. Onun qədim və zəngin tarixi, şəhər memarlığında öz əksini tapmışdır: burada qotik və barokko üslubunda tikilmiş və İntibah dövrünə aid binalar çoxdur. Yeni dövrə aid olan bir sıra məşhur, gözəl memarlıq abidələri və heykəllər Praqaya xüsusi gözəlllik verir [1,s.187].

Praqa qrad (Qradçanı) Vltavanın sol sahilinin yüksəkliklərində salınmış Praqanın tarixən üçüncü rayonudur. Burada Çexiyanın ən böyük qalası olan möhtəşəm Praqa (əvvəlki Kral) Qrad yerləşir. Qradaçanın turistlər tərəfindən ən çox sevilən yerlərindən biri Premonstrat ordeninin Poqorjelçdə yerləşən Straqoskiy Monastrı (1140-cı ildə əsası qoyulub, XVII əsrdə yenidən qurulmuş) və Çex Ədəbiyyat Muzeyidir (1679-cu il). Praqa qradında – bina, məbəd və istehkam kompleksləri öz əzəmətini qoruyur. Çexiyada hər kvadratmetrə düşən memarlıq və tarixi abidələrin (Zlata küçəsi, Müqəddəs Vita kilsəsi, şəkil qalereyası və s.) sayına görə ən sıx yer məhz buradır. Bu gün Çexiya Prezidentinin iqamətgahı olan bu qəsr çex krallarının və Müqəddəs Roma İmperiyasının imperatorlarının iqamətgahı olub. Deyilənə görə, bu, sahəsinə görə dünyada ən böyük prezident iqamətgahıdır, habelə dünyada ən böyük qəsrdir. Qradın ən qədim hissəsində Müqəddəs Vita kafedral kilsəsi yerləşir. Bu gözəl qotik tikili şəhərin "vizit kartı"dır.

Troya Praqanın kənarında yerləşən amma nüfuzlu və ən yaşıl rayonlarındandır. Troya qalası (1685-ci il) - səliqəli bağçalı və erkən barokko üslüblu möhtəşəm saraydır. Qalada XIX əsr çex incəsənətinin daimi koleksiyası yerləşdirilmişdir. Qalanın qarşısında heyvanların təbii həyatının izlənməsi mümkün olan açıq yerli zoopark var. Burada çox sayda teatr və konsert yerləri fəaliyyət göstərir: Milli Teatr, Dövlət Operası, Qara Teatr, Kukla Teatrı, Laterna Magika Teatrı, Spiral Teatrı, Rudolfinum (Dvorjakın adına Konsert Salonu), Bələdiyyə Evi (Smetananın adını daşıyan Salon), "Daş zəngli ev" və s. Marian meydanında Klementinum kilisəsində yerləşən Müqəddə Havel kostyelində və ya Müqəddəs Martin Kilsəsində Kamera müsiqisini dinləmək olar. Karl abidəsinin arxasında kostyolda Karlova körpüsündə hər gecə orqan konsertləri təşkil olunur.

Son vaxtlar festivallar, konfranslar, sərgilər və tədbirlər keçirməklə də Praqaya turistlər cəlb edilməkdədir. Praqada keçirilən ən böyük festivallar içərisində "Fotograf festivalı", "Pivə festivalı" , "Milli azlıqların beynəlxalq festivalı" "Işıq festivalı" aid etmək olar.

Bu istiqamətdə həmçinin müxtəlif musiqi tədbirləri keçirilməkdədir. Hər il dünyanın müxtəlif ölkələrindən qaraçı ansamblları "Xamoro" festivalında iştirak etmək üçün Praqaya toplaşır. Çexiyada musiqi çox populyar incəsənət növüdür. Dünyagörmüş insanlar deyir: "Hər bir çex musiqiçidir". Bu deyim çexlərin musiqiyə məhəbbətini lakonik şəkildə xarakterizə edir. 1946-cı ilin may ayından bəri bir çox ölkələrin musiqiçiləri, sənətsevərləri Praqaya gəlir və burada konsert proqramlarında, musiqi tədbirlərində - "Praqa Baharı» festivalında iştirak edirlər. Dram və baletə gəlincə, o, təkcə Praqada deyil, həm də Bohemiya və Moraviyanın bir neçə şəhərində də çox gözəl təqdim olunur. Çexiyada kukla teatrlarının da zəngin ənənəsi var. XVIII əsrdən bəri səyyar fəaliyyət göstərən Çexiya kukla teatrları müasir dövrdə peşəkar sənət ocaqları kimi geniş tanınır.

Çexiya istehsalının dörddə üçünü ixrac edən olduqca açıq bir iqtisadiyyata sahib olmaqla xarici sərmayəçilər üçün çox cəlbedici ölkədir. Ölkə Avropa Birliyi ölkələrinə nəzərən inkişaf etmiş, adambaşına düşən gəlirə görə yüksək gəlirli iqtisadiyyata sahibdir.

Çexiya başdan-başa mineral bulaqlarla zəngindir. Bu çeşmələr Moraviyada, Mərkəzi Bohemiyada, hətta ölkənin şimalında da var. Lakin müalicəvi sular ən çox Qərbi Bohemiyadakı "kurort üçbucağı"nda cəmləşib: Karlovı Varı, Marianskiye Lazne və Frantişkovı Lazne şəhərləri.

Bu kurortlar xüsusilə standart müalicə- sağlamlıq deyil artıq yeni istiqamətdə müalicələr tətbiq etməyə başlamışdırlar. Buraya müalicə ilə paralel olaraq əyləncə və spanı da daxil edirlər. Yəni əvvəlkindən fərqli olaraq əyləndirərək, əhval ruhiyəni qaldıraraq sağlalığın bərpa edilməsinə diqqət ayırırlar.

Karlovı Varı sanatoriya şəhəridir, onun bütün həyatı tarixi mərkəzdə cəmlənib, müalicəvi bulaqların əksəri buradadır. Tipik şəhər mənzərəsi belədir: yeraltı sularla isinən və qışda da donmayan Tepla çayının sahilində yavaş-yavaş gəzişən kurortun qonaqları. Şəhərin hər addımında otellər, qonaq evləri və kirayə

verilən mənzillər yerləşir. Onların ümumi sayı 2 min obyektdən çoxdur. Otellər arasında ən qədimi və ən məşhuru "İmperial" və qrand-otel "Pupp", 2006-cı ildə Ceyms Bond haqqında filmlərdən birinin çəkildiyi "Kazino Royal"dır. Karlovı Varıda istirahət edənlərin 90 faizi Rusiya və keçmiş Sovet İttifaqı vətəndaşlarıdır. Burada almanlar da az deyil. Karlovı Varı təkcə müalicə və istirahət deyil. Bu şəhər həm də kinofestivalı və "Moser" şüşə istehsalı ilə məşhurdur. "Thermal" otelində hər ilin iyul ayında keçirilən kinofestival "A" kateqoriyasına aid edilir və bura ulduzlar toplaşır. Müxtəlif illərdə Karlovı Varıda Mel Gibson, Con Travolta və digər məşhurların olması hər kəsin dilindən düşmür. Karlovı Varıda keçirilən beynəlxalq kinofestivalın "Ən yaxşı film" üçün əsas mükafatı "Büllur qlobus"dur. Artıq neçə ildir ki, o, məşhur şüşə fabriki "Moser"də istehsal edilir.

Karlovı Varıdan 48 kilometr məsafədə daha bir kurort şəhəri Marianskiye Lazne yerləşir ("Lazne" çex dilində "hamam" deməkdir). O, Çexiyanın ölçüsünə görə ikinci kurort şəhəridir. Marianskiye Laznenin yerləşdiyi vilayət həddən artıq mənzərəli və müalicəvi təbii bulaqları ilə son dərəcə zəngindir. Kurortun yaxınlığında 60, özündə isə 40 çeşmə var. "Marianske-Lazne" kurortu böyrək xəstəlikləri, qadın xəstəlikləri, ürək-damar xəstəlikləri və b. xəstəliklərin müalicəsi sahəsində ixtisaslaşıb. "Luqaçovitsa" kurortunda astma, yuxarı tənəffüs yolları və digər xəstəliklər müalicə edilir. "Tepliçe" kurortu isə termal suyun köməyi ilə dayaq-hərəkət sistemi xəstəliklərinin müalicəsi sahəsində ixtisaslaşıb. "Yanske-Lazne" kurortunda da uşaqlarda dayaq-hərəkət sistemi xəstəlikləri, böyüklərdə iflic və s. xəstəliklər müalicə edilir. Tərkibində karbon dioksid, mineral duz və dəmir olan bu çeşmələrin əksəri Karlovı Varıdakı bulaqlardan fərqli olaraq soyuqdur. Şəhər üç tərəfdən iynəyarpaqlı sıx meşə ilə əhatə olunub. Buranın havası əvəzolunmazdır, fitonsidlərlə doludur. Marian-Lazne və ya Marienbad tarix və müasirliyin qovuşduğu, məzuniyyət keçirməyin, idman və gəzinti ilə məşğul olmaq üçün əla şəraitin olduğu və bütün bunları zəngin mədəni proqram ilə birləşdirən yerdir.

Qərbi Bogemiyanın müalicə üçbucağının digər məşhur şəhəri olan Frantişkovı Lazne zərif neo-klassik kalonyalar, baxımlı parklar, sakitlik, istirahət və rahatlama hissi bəxş edir. Johan van Goethe burada olarkən şəhəri "Yer üzünün cənəti" adlandırmışdır.

Burada özünüzü ən az 20 soyuq mineral mənbənin, birinci sinif təbii palçığın və müalicəvi xüsusiyyətlərə sahib gazların rahatladıcı təsirinə buraxa bilərsiniz. Bunların hamısı əzələ- onurğa sistemi, ürək- damar xəstəlikləri və sonsuzluq daxil olmaqla ginekolojik xəstəliklərin müalicəsində yararlıdır [3].

Yerli palçıq müalicələri termik, kimyəvi və mexaniki təsirlərə malik olan ənənəvi müalicəvi üsuldur. Palçıq müalicəsi palçıq və mineral suyun qalın bir qarışıq birləşməsindən ibarətdir ki, bu da bədən istiliyindən əhəmiyyətli dərəcədə yüksək olan bir temperatura qədər qızdırılır. Müalicə əzələlərin hərəkətliliyinə və müalicə olunan toxumalarda ağrıya müsbət təsir göstərir. Bununla belə zərif spa evləri itirilən canlılığınızı bərpa etmək, bədəni cavanlaşdırmaq və zehni stresdən azad etmək qarantiyası verən əyləncəli prosedurlar təklif edir.

Nəticə etibarı ilə beynəlxalq turizm Çexiyanın sosial-iqtisadi inkişafına müsbət təsir edən ən mühüm sahələrin başında gəlir. Başda dərketmə, müalicə-sağlamlıq növlərinə diqqət ayırmaqla ölkənin turizm siyasətində turist axınlarının gücləndirilməsi istiqamətində ciddi tədbirlər görülməkdədir.

### Ədəbiyyat:

1. Məmmədov C.A, Soltanova H.B, Rəhimov S.H "Beynəlxalq turizmin coğrafiyası". (527) Bakı 2002
2. Travel and Tourism Economic Impact 2018. Czech Republic. p 2
3. https://www.czechtourism.com/t/frantiskovy-lazne-frazensbad/

### Czech Republic like a popular tourism destination

**Summary**

Tourists always interested in Czech Republic where it is either one of the political and economic of European or is one of the leading countries in terms of tourism industry that has strategic geoghraphical position, substantial industrial culture,fundamental historical monuments and nature. Tourism in the Czech economy is a major source of income. The country's treatment tours have a strong leadership position among other European countries. Recreation in Czech balneological resorts for health restoration means high quality service, affordable prices, hospitable indigenous people, as well as excellent climatic conditions. In recent years, the Czech Republic has been boosting the flow of tourists through various exhibitions, festivals and events.

**Чехская Республики как популярное туристическое направление**

**Резюме**

Чешская Республика, являющаяся одной из ведущих европейских стран как в политической, так и в экономической, а также туристической сферах, всегда была в постоянном интересе туристов благодаря своему стратегическому географическому положению, солидным традициям промышленности, глубоким историческим памятникам и природе. Туризм в чешской экономике является основным источником дохода. Лечебные туры страны занимают прочные лидерские позиции среди других европейских стран. Отдых на чешских бальнеологических курортах для оздоровления означает высокое качество обслуживания, доступные цены, гостеприимные коренные народы, а также отличные климатические условия. В Чешской Республике различные виды выставок, фестивалей и мероприятий стимулируют поток туристов в страну.

**Rəyçi: b.m.R.K. Ağasıyeva**

**Cəfərova Leyla Mühiddin qızı**
Azərbaycan Dillər Universiteti

# TƏHLÜKƏSİZLİK ANLAYIŞI VƏ ONUN MÜASİR BEYNƏLXALQ SİSTEMDƏ TƏSİRİ

***Açar sözlər:*** *Təhlükəsizlik, təhdid, terrorizm, diplomatiya, mütəşəkkil cinayətkarlıq*
***Key words:*** *Security, threat, terrorism, diplomacy, reforms, organized crime*
***Ключевые слова:*** *Безопасность, угроза, терроризм, дипломатия, организованная преступность*

Beynəlxalq münasibətlərinin aktual problemi kimi sülhün qorunması və təhlükəsizliyin təmin olunmasını xüsusilə vurğulamaq lazımdır. Ümumiyyətlə, təhlükəsizlik anlayışı ilk dəfə 1904-cü ildə Teoder Ruzvelt tərəfindən işlədilmişdir. Təhlükəsizlik anlayışı yarandığı ilk vaxtlarda yalnız dar mənada yəni, hərbi sahədə təhlükəsizliyin təmini başa düşülürdü. Qloballaşma prosesləri vüsət aldıqca, elmi-texniki inqilab inkişaf etdikcə artıq müxtəlif sferalarda təhlükəsizliyi təmin etmək zərurəti yaranırdı. Aydındır ki, təhlükəsizlik siyasi kateqoriyadır. Bəşəriyyət üçün təhlükəsizliyin nə qədər vacib olduğunu qədim dövrdə insanların kollektiv yaşamasından anlamaq olar. Birgə yaşayış kollektivin bir-birindən və qrup daxilində qorunması zərurətini yaradırdı. Bu səbəbdən təhlükəsizliyə sosial anlayış kimi də baxıla bilər.

Müasir dövrümüzdə iqtisadi, sosial, mədəni, informasiya və s. sferalarda təhlükəsizliyi təmin etmək lazım gəlir. Təhlükəsizliyin qorunması hər bir dövlətin təhlükəsizlik konsepsiyalarında öz əksini tapmış prioritet məsələlərdən biridir. Bir ölkə hüdudlarında sabitliyin qorunması və layiqli inkişaf səviyyəsi eyni zamanda beynəlxalq arenada nüfuzlu faktora çevrilmək üçün ilk öncə təhlükəsizliyi təmin etmək lazım gəlir.

Bəs, təhlükəsizlik nədir? Ojegov S.I. "Təhlükəsizliyi" kiməsə, nəyəsə təhlükə olmadığı bir vəziyyət olaraq şərh edir [9,73]. Lakin digər tədqiqatçıların fikrincə, təhlükəsizlik sözün əsl mənasında təhlükənin olduğunu özündə ehtiva edir, yəni təhlükəsizlik tədbirlərinin alınması artıq hədələrin olduğuna əyani sübutdur. Realist mövqedən yanaşsaq, həqiqətən tam təhlükəsiz bir mühit yoxdur və hər an bizi hansısa təhlükə gözləyə bilər [10,102]. Qeyd etmək lazımdır ki, təhlükəsizliyin iki növü ayırd edilir:

-hipotetik təhlükənin olmaması,

-təhlükələrdən real qorunma, onlara etibarlı müqavimət göstərmək qabiliyyəti [8; 56].

Con Herts tərəfindən elmə gətirilən təhlükəsizlik dilemması beynəlxalq münasibətlərdə xüsusi bir termindir. Təhlükəsizlik dilemması dövlətlər arasında təhlükəsizliyə nail olmaq məqsədilə başlayan daha sonra isə hərbi münaqişəyə yol açan rəqabət xarakterli bir məvhumdur. Soyuq müharibə dövründə dövlətlərin sürətlə silahlanması, əslində, öz təhlükəsizliklərini təhdidlərdən qorumağa yönəlmiş bir addım idi. Məhz bu nöqteyi nəzərdən vurğulaya bilərik ki, təhlükəsizlik dilemması anarxiya vəziyyətində yaranır. Anarxiya vəziyyətində isə dövlətlər biri digərinin sonrakı həmləsini öncədən anlaya bilmir, məqsədin müdafiə yoxsa hücum olduğunu aydınlaşdırmaq qeyri-mümkün olur, nəticə etibarilə digər dövlətlərə qarşı öz hərbi güclərini artırmağa can atırlar.

Herbert Batterfild və Con Herts təhlükəsizlik dilemmasına öz elmi əsərlərində aydınlıq gətirmişdilər. Lakin Herbert Batterfild özünün *"Tarix və insan şəraiti"* kitabında təhlükəsizlik dilemması anlayışını izah etsədə, ona spesifik ad verməmişdir. Con Herts təhlükəsizlik dilemmasını 1951-ci ildə *"Siyasi realizm və siyasi idealizm"* adlı kitabında elmi dövriyyəyə gətirmişdir.

Kenned Volts dövlətlərinin öz təhlükəsizliyini təmin etməsini anarxik sistemdə onlar üçün bir motivasiya rolunda çıxış etdiyini qeyd edir. Beynəlxalq münasibətləri tədqiq edən bəzi alimlərin fikrincə təhlükəsizliyini təmin etmək məqsədiylə dövlətlərin sürətlə silahlanması konfliktlərə səbəb ola bilər. Bu baxımdan tədqiqatçılar təhlükəsizlik həlqəsini hərəkət-reaksiya prosesi kimi təsəvvür edirlər. Dövlətlərin silahlanması yeni hərb texnologiyasına yiyələnməsi artıq dövlətlər üçün öz təhlükəsizliyi naminə adi hal hesab olunur.

Müasir dövrün tələblərinə uyğun olaraq, müxtəlif sferalarda təhlükəsizliyi təmin etmək nə qədər vacibdirsə, dövlətin təhlükəsizliyi təmin etməsi üçün hansı vasitələrdən istifadə etməsi daha da vacibdir. Soft power-yumşaq güc vasitəsiylə milli maraqların təminindən söhbət gedirsə, hard power - güc yolu ilə milli maraqların həyata keçirilməsi deməkdir.

Yeni dövr diplomatiyası vuruşmaq, müharibə ruhundan uzaq olmalıdır, lakin öz təhlükəsizliyi və həyati əhəmiyyət maraqları naminə təəssüf ki, müharibəni seçən beynəlxalq münasibətlərin aktorlarının sayı az deyil. Doğrudur bəzi alimlərin fikrincə, güc diplomatiyası keçmişdə qalıb, yalnız yumşaq güc-soft power aktualdır. Lakin dünyanın qaynar nöqtələrinə nəzər yetirdikdə yumşaq güc-soft power aktuallığı sual altında

qalır. Dövlətin beynəlxalq arenada nüfuzu təhlükəsizliyini təmin etməkdən keçir ki, təhlükəsizliyini təmin olunmasında güclü kəşfiyyat oraqlarının rolu danılmazdır. xüsusi xidmət orqanlarının səmərəli fəaliyyəti beynəlxalq arenada dövlətin hegomonluğunu təlqin etməyə səbəb olur. Kəşfiyyat qədim dövrdən mövcud olmuşdur. Sadəcə olaraq, qədim dövrün kəşfiyyatçıları tacirlər olmuş və daha primitiv formada informasiya əldə edib öz ölkələrini məlumatlandırırdılar. Diplomatların kəşfiyyatçı funksiyasını yerinə yetirdiyi dövrdə diplomatlar qarşısında qoyulan tələblər olduqca ağır idi. Qeyd etmək lazımdır ki, XX əsrin əvvəllərində dünya dövlətləri ayrıca kəşfiyyat qurumu yaratmağa müvəffəq oldular. Almaniya ilk dəfə olaraq kəşfiyyat işləri ilə məşğul olan orqan yaradır. Məhz bundan sonra digər dövlətlər xüsusi xidmət orqanlarını yaradərlar. Xüsusi xidmət orqanlarının tədricən hərbi kəşfiyyat, əks- kəşfiyyat, xarici kəşfiyyat mərkəzləri fəaliyyət göstərməyə başlayır. ETİ inkişaf etdikcə dövlətlər öz casusluq şəbəkələrini daha mütəşəkkil şəkildə qurmağa başlayırlar. Casusluq şəbəkələri ən müasir texnologiya ilə təmin olunur.

90-ci ildən başlayaraq, qlobal siyasətdə ikiqütblü dünyanın dağılması nəticəsində, təhlükəsizlik sahəsindəki araşdırmalar tədris fənni kimi öz siyasi əhəmiyyətini yenidən qazanmağa başladı və həmin dövr üçün təhlükəsizliyin əsas subyekti kimi yalnız dövlət hesab olunurdu [5,60]. XX əsrin sonlarında təhlükəsizliyin təmin olunması yalnız ənənəvi üsullara söykənirdisə, yeni dövr üçün təhlükəsizliyin təmini müttəfiq və rəqiblərin müəyyən edilməsi qarşılıqlı əməkdaşlıq, ümumi perspektivlərdən yararlanaraq qarşıdakı düşmənin müttəfiqə çevrilməsi nəzərdə tutulmalıdır ki, bu isə müasir diplomatiyanın məzmununu özündə ehtiva edir [6,45].

30 illik müharibədən sonra Vestfal sisteminin əsası qoyulması ilə təkcə beynəlxalq münasibətlər sistemində yeni epoxa başlanmadı eyni zamanda ümumi –kollektiv təhlükəsizlik anlayışı meydana gəldi. Milli təhlükəsizlik dedikdə dövlətin özünü daxili və xarici təhdidlərdən müdafiə etməsi anlaşılırsa, kollektiv təhlükəsizlikdə isə təhlükəsizlik mühiti beynəlxalq münasibətlərin əsas aktoru olan kollektiv təhlükəsizlik sisteminin iştirakçısı olan hər bir dövlətdən asılıdır. Hər bir cəmiyyət təhlükəsiz mühit arzusundadır və bu məsələdə hər bir cəmiyyətin öz dövlətindən müvafiq olaraq gözləntiləri vardır. Prinsipcə hər dövlətin hakimiyyətinin nüfuzu onun öz vətəndaşlarını daxili və xarici təhdidlərdən nə dərəcədə qoruyub qoruya bilmədiyi ilə ölçülür.

Unipolyar təhlükəsiz modelini dəstəkləyən alimlərin fikrincə, bu ən optimal modeldir. Belə ki, bu modeldə təhlükəsizliyin qarantı kimi beynəlxalq münasibətlər sisteminin nüfuzlu aktoru olan dövlət çıxış edir. Unipolyar təhlükəsiz modelində eyni zamanda dövlət bir növ dünya polisi kimi təqdim olunur. Bu təhlükəsizlik modelini görə dünya siyasəti yalnız o zaman nizamlı olar ki, dövlət yeganə aktor olsun və təhlükəsizlik sisteminə töhfəsini verə biləcək iqtidarda olsun. Hesab olunur ki, hegemonluq sülhü qorumağa, təhlükəsizliyi təmin etməyə əsas verəcək. "Hegemonia" qədim yunan sözü olub rəhbərlik, liderlik etmək mənasını verir. Məhz unipolyar təhlükəsiz modeli də dünya siyasətində dövlətin hegemonluğuna əsaslanır. Beynəlxalq münasibətlər sistemində hər bir bərabərhüquqlu dövlət mövcud sistem daxilindəki münasibətləri, status-kvonu saxlamağa çalışırsa bu sistem daxilindəki hegemon dövlətdən ehtiyyatlanmasından qaynaqlanır [1,17].

Çünki unipolyar təhlükəsiz modelini öz təhlükəsizlik strategiyası kimi müəyyənləmüharibədən sonra ABŞ unipolyar təhlükəsiz modelini qəbul etdi. Z.Bzejinski unipolyar təhlükəsiz modelini ABŞ-ın təhlükəsizlik strategiyasının vacib prioriteti kimi ön plana çəkşdirmiş dövlət milli mənafeyini qoruyub, öz xarici siyasətini reallaşdirakən xırda müqavimətlərlə üzləşməyinə baxmayaraq, dünya polisi qismində çıxış edir.

Bipolyar təhlükəsiz modelinin tərafdarlarına görə, unipolyar təhlükəsiz modeli heç də düşünüldüyü kimi dünya siyasətinə əmin-amanlıq bəxş etməyəcək, tam əksinə xautik, spontan bir situasiya yaranacaqdır. Dünyada təhlükəsizlik yalnız o zaman təmin oluna bilər ki, bipolyar təhlükəsiz modeli tətbiq olunsun. Bəs bipolyar təhlükəsiz modelinin unipolyar təhlükəsiz modelindən üstünlüyü nədir? Bipolyar sistemdə iki faktor bir birlərinin davranışına nəzərət edir və beləliklə onlar faktiki olaraq təhlükəsizlik sferasında olan inamsızlıq aradan qalxır. Lakin unipolyar təhlükəsiz modelində isə hər an hegemon və güclü qüvvələr arasında münaqişə yarana bilər. Bu isə mövcud təhlükəsizlik sisteminə təhdid olmaqla yanaşı müharibəyə səbəb olacaq.

Multipolyar təhlükəsiz modeli isə təhlükəsizliyin digər iki modelindən olduqca fərqlənir. Adından göründüyü kimi "multi" çox mənasını verir, yəni beynəlxalq təhlükəsizlik sistemində çoxqütüblülük olduğuna görə əzələ nümayişi bir kənara qoyulur və bütün təhlükəsizlik sisteminin iştirakçıları bərabər faktor kimi çıxış edirlər. Bu modeldə orta düşmənçilik həddində olan aktorlar ittifaqlar qurmağa meylli olurlar. Bir növ bu modeli kollektiv təhlükəsizlik sisteminin alternativi hesab etmək olar.

T.Hobbsun təhlükəsizlik nəzəriyyəsi hər bir dövlətin öz təhlükəsizlik maraqlarını qorumaq naminə sosial kollektivizmi ön plana çəkdiyini daha çox qabardır. Mahiyyət etibarı ilə bu konsepsiya kollektiv təhlükəsizlik sisteminə əsaslanır [9,58]. Koalisiyanın bir üzvünə qarşı müharibə digər bütün üzvlərinə qarşı müharibə anlamını kəsb edir ki, mütəfəkkirə görə, belə mühitdə müharibə ehtimalı olduqca aşağıdır. Kollektiv təhlükəsizlik mühiti dedikdə beynəlxalq münasibətlər arenasında dövlətlərarası sülh münasibətlərindən söhbət gedir. Müasir dövrümüzdə kollektiv təhlükəsizlik modeli kimi NATO-nu misal göstərilə bilər. NATO-nu təkcə kollektiv təhlükəsizlik modeli hesab etmək doğru olmazdı o, eyni zamanda ABŞ-nın maraqlarına xidmət edən bir qurumdur. Qlobal təhlükəsizlik modeli ilə kollektiv təhlükəsizlik modelini qarışdırmamaq lazımdır. **Kollektiv təhlükəsizlik** iki və daha artıq dövlətin öz təhlükəsizliyi naminə birləşməsi və təhdidlərə qarşı mübarizəsidirsə, **qlobal təhlükəsizlik məfhumu** bütün dünya dövlətlərinin həyati əhəmiyyətli maraqlarının təmini və sülhün qorunmasını özündə əks etdirir.Təhlükəsizlik anlayışının dərk olunması onun əslində **maraq** və **təhdid** anlayışları ilə bağlı olduğu ortaya çıxır [7,100]. Müasir dövrümüzdə qlobal təhlükəsizliyə **təhdid olan əsas hədələr** aşağıdakı kimi qruplaşdırılır:

1. Terrorizm
2. Vətəndaş müharibələri
3. Mütəşəkkil cinayətkarlıq
4. Kiber cinayətkarlıq
5. Ekoloji problemlər

**Terrorizmə** vahid tərif olmasa da, onun haqqında deyilənləri ümumiləşdirsək belə anlaşılır ki, geniş insan kütlələrində güclü psixoloji manipulyasiya - qorxu yaradır, dövlətlərarası münasibətləri gərginləşdirir. Artıq qlobal xarakter alan terrorizmə vaxtiylə yerli-lokal hadisə kimi baxılırdısa, müasir dövrümüzdə institutlaşmış terror təşkilalatlarıyla mübarizə aktuallıq təşkil edir [3,90]. Məhşur terror qruplaşmaları sıraqsında İŞİD, Əl-Qaidə, Hizbullah, PKK-nı misal göstərə bilərik.

**Vətəndaş müharibələri** ölkə sərhədləri daxilində baş verən müxtəlif narazıçılıq səbəbilə yaranan münaqişələrdir. Yaranan konfliktlər zaman geçdikcə böyüyür daxili müharibəyə daha sonra isə dövlət sərhədlərini aşaraq beynəlxalq müstəviyə qalxır. Ərəb ölkələrində, Mərkəzi Afrika ölkələrində, Cənubi Sudanda baş vermiş vətəndaş müharibələri nəinki ölkədaxili təhlükəsizliyə təhdiddir, bu müharibələr eyni zamanda beynəlxalq təhlükəsizliyə təhdiddir.

**Mütəşəkkil cinayətkarlıq** bütün dünya ölkələrini maraqlandıran aktual problemlərdən biridir. Belə ki, mütəşəkkil cinayətkarlıqla mübarizə hər bir dövlətin təhlükəsizliyin təmin olunmasının prioritet istiqamətlərindəndir. Transmilli cinayətlər beynəlxalq cinayətlərdən fərqlənir, beləki bu cinayətlər özündə daha çox anti-humanist meylləri ehtiva edir. Transmilli cinayətləri üç geniş kateqoriyada qruplaşdırmaq olar. 1) Narkotiklərin və psixotrop maddələrin qanunsuz dövriyyəsi, qaçaqmalçılq, qanunsuz silah alveri 2) insan alveri, 3) fırıldaqçılıq, reketçilik, çirkli pulların yuyulması və korrupsiya

**Kiber cinayətkarlıq** - İnformasiya təhlükəsizliyinin əsasında informasiyanın mühafizəsi məsələləri dayanır. İnformasiyanın hüquqi mühafizəsi informasiya təhlükəsizliyinin normativ-hüquqi bazasına əsaslanır. Kibercinayətkarlıq probleminin hərtərəfli tədqiqi və onunla beynəlxalq miqyasda cinayət-hüquqi mübarizə tədbirləri ilk dəfə İƏİT tərəfindən həyata keçirilmişdir. Bu təşkilat 1983-1985-ci illər ərzində kibercinayətlərə görə cinayət məsuliyyətini müəyyən edən normalarının harmoniyalaşdırılması imkanlarını tədqiq etmişdir.

**Ekoloji problemlər** - Dünya İqtisadi Forumunun verdiyi açıqlamalara əsasən beynəlxalq təhlükəsizliyə əsas təhdidlərdən biridir. Beləki ekoloji böhranlarının qarşısını almaq ona görə çətindir ki, bəşəriyyəti təhdid edən problemlərin yaranması antropogen fəaliyyətin nəticəsidir [4,17]. Plastik tullantıların artması, ozon qatının deşilməsi, istixana effektinin yaranması, dünya ölkələrinin düşündürən aktual problemlərdəndir. Gələcəkdə enerji və su ehtiyatlarının tükənməsi, bu səbəbdən yaranan müharibələr dövlətlətin təhlükəsizliyini sual altında qoyur.

Hal-hazırda dövlətlərin qarşısında duran əsas məsələlərdən biri əməkdaşlıq əsasında beynəlxalq təhlükəsizliyin təmin olunmasıdır. Sadalanan təhdidlərdən qorunmaq üçün müxtəlif institutların fəaliyyətindən istifadə olunur. Beləliklə, inteqrasiya prosesi öz inkişafında bir neçə mərhələdən keçir və təcrübəsi göstərir ki, bu proses əvvəlcə iqtisadi sahədən başlanır, ölkələrin iqtisadi fəaliyyətini birləşdirir, sonra isə onların daxili və xarici siyasətini, müdafiə və təhlükəsizlik məsələlərinin ümumi mərkəzdən idarə olunmasını əhatə edir [2,80].

**Ədəbiyyat:**

1.Abbasbəyli Ağalar, Nəcəfov Etibar Beynəlxalq münasibətlər nəzəriyyəsi Mürtəcim nəşriyyatı, Bakı-2007 208 səh.

2.Həsənov Əli Müasir beynəlxalq münasibətlər və Azərbaycanın xarici siyasəti Azərbaycan nəşriyyatı, Bakı-2005 637 səh.

3.Qələndərova Elnarə Gənc hüquqşunasın tribunası və Beynəlxalq hüquq jurnalı Qanun 01 (267), 2017

4. Məmmədov Qərib, Xəlilov Mahmud Ekologiya və Ətraf mühitin mühafizəsi Elm nəşriyyatı, Bakı-2014 435 səh.

5.Collins Alan, Contemporary Security Studies, Oxford−New York, Oxford University Press, 2007, 306 page

6.Edward A. Kolodziej, Security and International relations, Cambridge University Press, 2005, 250 page

7.Dannreuther Roland International security The contemporary agenda Second edition Polity Press, 2013, 207 page

8.К.В.Фролов и др. Безопасность России: правовые, социально-экономические и национально-технические аспекты. Словарь терминов и определений М-1999, с – 361

9.Ожегов С.И.; Под ред. проф. Л.И. Скворцова. Толковый словарь русского языка: ок. 100 000 слов, терминов и фразеологических выражений М-2010. с–1360

10. Ходаковский Е.А. Россия в глобальном противостоянии Запада и Востока. СПб, 2007, с-33-35, Цит. по: Моздаков А.Ю. Социальная безопасность и безопасность личности, Государство и право. 2008.№6

**Concept of security and its impact on modern international system**

**Summary**

The fundamental purpose of this article is to deal with models and concepts of global security. Firstly international security is analyzing from different standpoints. Enumerating of global security models in this article provides explanation of best international security samples. Various theories about security issueswere defined. At the same time sorts of threats to political system are highlighted. Threats to global security increase rapidly. At this point of view protection of governments from menaces is very actual. In one word this paper aims to describe main concepts of security

**Концепция безопасности и ее влияние насовременную международную систему**

**Резюме**

Фундаментальной целью этой статьи является исследование моделей и концепций глобальной безопасности. В первую очередь, международная безопасность анализируется с различных точек зрения. Перечисление моделей глобальной безопасности в этой статье дает объяснение лучшим образцам международной безопасности. Были определены различные теории о проблемах безопасности. В то же время выделяются виды угроз политической системе. Угрозы глобальной безопасности возрастают быстрыми темпами. С этой точки зрения защита правительств от угроз очень актуальна. Одним словом, эта статья призвана описать основные концепции безопасности.

**Rəyçi: dos.S.İmanova**

## PEDAQOGİKA PEDAGOGY ПЕДАГОГИКА

**Xudiyeva Fəxriyyə Telman qızı**
Ağdam rayonu, 149 saylı tam orta məktəb

# QADIN XEYRİYYƏ CƏMİYYƏTLƏRİ VƏ QADIN TƏHSİLİ

***Açar sözlər**: qadın xeyriyyə cəmiyyətləri, qadın təhsili, qız məktəbləri*
***Key words**: women's charitable society, women's education, women's schools*
***Ключевые слова**: женские благотворительные общество, женское образование, женские школы*

Azərbaycan XIX əsrin sonu, XX əsrin əvvəllərindən başlayaraq yüksəliş, tərəqqi mərhələsinə qədəm qoymuşdur. Bu dövrdə çox böyük milli ziyalı kadrlarımız yetişmiş, milli dilimiz, məktəbimiz, ana dilli dərsliklərimiz meydana gəlmişdir. Bu dövrdə həmçinin qadınlar arasında geniş maarifçilik hərəkatı nəticəsində ölkədə bir çox qadın təşkilatları, xeyriyyə cəmiyyətləri yarandı, qadın hüquqları uğrunda mübarizələr başladı, qadın təhsili diqqət mərkəzinə keçirildi.

XIX əsrin əvvəllərində rus çarizmi tərəfindən 1846-cı ildə Tiflisdə yaradılmış "Müqəddəs Nina" xeyriyyə cəmiyyəti elə bu adda da Azərbaycanda yaradılmış bu cəmiyyət qadınların təhsilinə xüsusi fikir verdi və müxtəlif tədris müəssisələri açmağa başladı. "Müqəddəs Nina"nın Xeyriyyə cəmiyyətinin Şamaxıda, Bakıda, Gəncə və İrəvanda şöbələri yaranıb fəaliyyətə başladı.

Cəmiyyət zəngin adamların ianəsi hesabına, üzvlük haqqı toplayır toplanan vəsait hesabına məktəblər açır, qadın problemlərini, hüquqlarını həll edirdi.

XIX əsrin ortalarında Tiflis mühitində yetişən ziyalılarımızın fəaliyyəti sayəsində Bakıda da mədəni-maarif sahəsində bir-birinin ardınca "Nəşri – Maarif", "Nicat", "Şəfa", "Qafqaz Müsəlman Qadınları Xeyriyyə Cəmiyyəti", "Müqəddəs Nina" və "Müqəddəs Ripsimi" adlı qadın xeyriyyə cəmiyyətləri yarandı və qadın təhsili məsləsi əsas diqqət mərkəzində oldu. Akademik Hüseyn Əhmədov yazır ki, " Azərbaycan ərazisində rus dilində ilk qız məktəbi 1848-ci il aprelin 30-da Şamaxıda açıldı. "Müqəddəs Nina" qız məktəbi adlanan bu məktəb 11 il fəaliyyət göstərdi və Quberniya mərkəzinin Şamaxıdan Bakıya köçürülməsi ilə əlaqədar 1861-ci ildə həmin məktəb Bakıya köçürüldü" (1, 84)

Tiflisdə fəaliyyət göstərən "Müqəddəs Nina" cəmiyyətinin Azərbaycanda da eyniadlı qadın təhsil cəmiyyəti 1850-ci illərdə fəaliyyət göstərirdi. Bu cəmiyyətin üzvləri arasında 17 nəfər azərbaycanlı qadın vardı. Onların arasında Fatma Əsədbəyova, Xədicə Haqverdiyeva, Gövhər Qutqaşinskaya, Balaxanım Xandəmirova və başqalarını göstərmək olar. Bu cəmiyyət ölkədə qadın hərəkatına stimul verdi və bir çox maarifpərvər qadınlar öz evlərində qadınlara, qızlara təhsil verməyə başladılar.

Belə ki, 1850-ci ildə maarifçi Dilbər xanım atası Mirmahmudun köməyi ilə Şamaxıda, öz evində qız məktəbi açdı ki, burada 863-cü ilə qədər şəriət, ana dili, nəğmə və s. dərslər tədris olunurdu. 1906-cı ildə isə Gəncədə ilk dəfə olaraq Müsəlman Qadın Komitəsi qadınlar arasında xeyriyyə marafonu keçirmiş, "Müqəddəs Nina" məktəbini bitirmiş Mədinə xanım Vəkilova-Qiyasbəyli də 1906-cı ildə Salahlı kəndində öz evində qadın məktəbi açmışdı. Bundan əlavə, 1906-cı ildə Gövhər Cəfərzadə-Şövqiyyə də öz evində qadın məktəbləri açmışdır.

1910 -cu ilin əvvəlində Tiflisdə Qafqaz Müsəlman Qadın Xeyriyyə Cəmiyyəti yaranmışıdr. Həmin cəmiyyətin işinə 40 nəfərdən çox ziyalı qadın cəlb olunmuşdur. Burada da dörd nəfərdən ibarət – Gövhər xanım Qacar, Nigar xanım Şıxlinskaya, Məsimə xanım Talışinskaya və Səltənət xanım Əhmədova cəmiyyətə daimi üzv seçilmişdir. Cəmiyyətin sədri Gövhər xanım Qacar, müavini Həmidə xanım Cavanşir, xəzinədar isə Mina xanım Talışinskaya olur. Dörd nəfər fəxri, iyirmi bir nəfər həqiqi, iki nəfər qeyri – həqiqi və dörd nəfər ömürlük üzv seçilir. Az bir müddət ərzində həyata keçirilən tədbirlər bütün Qafqaza səs salır. Cəmiyyətin nəzdində bir neçə qız məktəbi yaradılır. Eyni zamanda, qadınlardan ibarət dram dərnəkləri təşkil olunur.

1911-ci ildə isə Xədicə Əlibəyovanın rəhbərliyi altında "İşıq" adlı ilk qadın jurnalı çap edilmişdir. Həlimə Axundova "İşıq" jurnalında "Müsəlman qadınların hüquqları" məqaləsində yazırdı: "Əgər biz insanıqsa onda bizimlə insan kimi rəftar etmək lazımdır. Mənim bacılarım, qətiyyət göstərməyin vaxtıdır. Bizə bilik, elm, təhsil lazımdır." 1912-ci ildə H.Z.Tağıyevin açdığı rus-müsəlman qız məktəbinin ilk məzunlarından olan Nazlı Tahirova Naxçıvanda qızlar məktəbində müəllim, sonra pedaqoji məktəbin müdiri olur.

1914-cü ildə Bakıda Hənifə xanım Zərdabi "Müsəlman Qadın Xeyriyyə Cəmiyyəti" yaratmışdır. Azərbaycanın ziyalı qadınlarından Əminə xanım Ağayeva, Mina xanım Aslanova, Nigar xanım Vəlibəyova, Gövhər xanım Vəlibəyova, Gövhər xanım Qazıyeva və başqaları xeyriyyə cəmiyyətinin mədəni tədbirlərinin fəal üzvləri olmuşdular. Cəmiyyətin fəxri sədri neft sənayesinin görkəmli nümayəndəsi Murtuza Muxtarovun həyat yoldaşı Liza xanım Muxtarova idi. Cəmiyyətin bütün məsələləri, görüləcək işlər onun evində müzakirə olunurdu. Cəmiyyət ardıcıl olaraq tez-tez mədəni tədbirlər həyata keçirir, qız məktəbində tamaşalar təşkil edirdilər. cəmiyyətin maarifçilik sahəsində ən mühüm xidmətlərindən biri 1917-ci ildə Bakıda yoxsul qızlar üçün peşə məktəbi açması olmuşdur.Lakin məktəb 1918-ci il mart faciəsindən sonra fəaliyyətini dayandırmışıdr.

İrəvanda 1850-ci illərdə yaradılmış “Müqəddəs Ripsime” qadın cəmiyyəti qadınların, qızların təhsilində, maariflənməsində geniş fəaliyyət göstərirdi. Bu sahədə cəmiyyət bir çox xeyriyyə tədbirləri keçirirdi. “Müqəddəs Ripsime” İrəvan qadın xeyriyyəçilik cəmiyyətinin fəaliyyətində Naxçıvan əhli general-leytenant Ehsan xanın qızı Sonabəyim, Ehsan xanın oğlu Naxçıvan xanı general-mayor Kəlbəlixanın qızı Sarabəyim, ştabskapitan İsmayıl xanın həyat yoldaşı Cahan xanım, kapitan Hüseyn Sultanovun həyat yoldaşı Tovuzbəyim, Mahmud ağanın həyat yoldaşı Xırda xanım, Nəcəf ağanın həyat yoldaşı Bəyimcan xanım, Cavan ağanın həyat yoldaşı Xırda xanım kimi məşhur adamların qızları və həyat yoldaşları bu cəmiyyətdə fəal iştirak edirdilər.

“Müqəddəs Ripsime” xeyriyyə cəmiyyətinin İrəvan şöbəsində fəaliyyət göstərən mütərəqqi azərbaycanlı qadınları yeni məktəblərin açılması ilə bağlı müəyyən işlər görürdülər ki, 1850-ci ilin yanvarın 1-də İrəvan şəhərində ilk qız məktəbi açılmışdır. Burada da başqa millətlərin nümayəndələri ilə birlikdə azərbaycanlı qızları da təhsil alırdılar. 1851ci ildə 21 qızdan 3-ü, 1856-cı ildə 28 şagirddən 7 nəfəri azərbaycanlı idi. İrəvan qız məktəbində Mir Mehdi adlı bir müəllim tərəfindən Azərbaycan dili dərsi də tədris edilirdi .

Azərbaycanın qabaqcıl qadınlarının təşəbbüsü ilə 1864-cü ildə Dərbənddə, 1872-ci ildə Zaqatalada, 1873-cü ildə isə Şuşada qız məktəbləri açılmışıdır. O cümlədən, Bakıda 1874-cü ildə Marinskaya adını almış ilk qadın gimnaziyası fəaliyyətə başlamışdır.

Ən iri sənayeçi və mesenat Hacı Zeynalabdin Tağıyevin geniş və çoxcəhətli xeyriyyəçilik fəaliyyəti hamıya məlumdur ki, o Bakı inşaat-texniki və Bakı kommersiya məktəblərinin, Bakı Mariinskaya qadın gimnaziyasının fəxri himayəçisi olmuş və Bakı Aleksandrinskaya adını almış ilk rus-müsəlman qız pedaqoji məktəbini açmışdır ki, bu - onun maarif sahəsindəki fəaliyyətinin tacı sayılır. Azərbaycan qızları üçün xüsusi məktəbin yaradılması barədə Tağıyev hələ XIX əsrin 90-cı illərində düşünmüşdü. Belə ki, tanınmış ictimai xadim M.A.Şahtaxtinskiyə yazdığı 4 may 1896-cı il tarixli məktubunda Tağıyev qeyd edirdi: “Müsəlman qadınını olduğu qapalı həyatdan çıxarmaqdan ötrü yeganə bir yol var – “ yalnız məktəb və bu məktəbi elə yaratmaq, elə qurmaq lazımdır ki, müsəlmanlar ona rəğbətlə yanaşsın və tam əminliklə öz qızlarını ora oxumağa göndərsinlər”. Buradan görünür ki, belə məktəbin açılması o zaman üçün aktual və eyni zamanda olduqca mürəkkəb iş idi. Yalnız Hacı Zeynalabdin Tağıyevin qətiyyəti, müdrikliyi və bakılılar arasındakı nüfuzu, həmçinin onun vəsaiti sayəsində bu ideya uğurla başa çatmışdır. Bu tədris ocağı 9 oktyabr 1901-ci il tarixdən Tağıyevin həyat yoldaşı Sona xanımın ümumi rəhbərliyi altında fəaliyyətə başlamış, məktəbin müdiri isə Tiflisdə təhsil almış “Müqəddəs Nina" qız məktəbinin yetirməsi olan Hənifə xanım Məlikova olmuşdur ki o həm də ”Nicat” cəmiyyətinin qadın bölmələrinin yaradıcılarından biri olmuşdur. Maarifçilik tariximizdə, dünyəvi təhsilin inkişafında və savadlı mütəxəssislərin yetişməsində bu məktəbin böyük rolu olmuşdur.

Azərbaycanın müxtəlif bölgələrində də Xeyriyyə cəmiyyətləri yaradılmış və geniş fəaliyyət göstərmişdir. Belə ki, 1875-ci il oktyabrın 26-da Şuşada yaradılmış xeyriyyə cəmiyyəti tərəfindən ilk qız məktəbinin əsası qoyulmuş, 1884-cü il yanvarın 1-də isə Gəncə “Müqəddəs Nina” qadın xeyriyyə cəmiyyətinin xətti ilə 6 nəfər şagirdlə ilk qız məktəbi fəaliyyətə başlamışdır. Xeyriyyə cəmiyyətlərinin fəaliyyəti nəticəsində qızların təhsili genişlənmiş və hətta oğlan məktəblərinə də qızlar cəlb olunmuşdur. Qızların oğlan məktəblərinə cəlb edilməsinə Nuxa qəzasının Vartaşen (Oğuz) və Qarabulaq, Cəbrayıl qəzasının Qarğabazar kənd məktəblərində də rast gəlirik. Qarabulaq kəndində oxuyan 80 nəfər oğlandan 5 nəfəri qız idi. 1895-ci ildə Qubada iki sinifli ibtidai məktəb nəzdində qızlar üçün də ayrıca şöbə açılmışdı. Balaxanı realnı qız məktəbinin bazasında oğlanlarla qızların birgə təhsil aldığı gimnaziya yaradılmışdır ki, bütün bunlar haqqında prof. Hümeyir Əhmədov dəyərli kitab da yazmışdır (3).

Naxçıvanda isə XIX əsrin sonlarında burada pedaqoji mühit və pedaqoji fikir sürətlə inkişaf etmiş və yeni mütərəqqi məktəblər, yeni pedaqoji fikirlər yaranmağa başlamışdır. Naxçıvanda maarifçilik və yeni pedaqoji ideyalar böyük şair və pedaqoq, müəllim və məktəbdar Məhəmməd Tağı Sidqinin (1854-1903) əməli pedaqoji fəaliyyəti ilə daha da genişlənmiş və özünün yaratdığı yeni üsullu məktəblər, ədəbi-pedaqoji

**S**erov knyaz Mixayıl Aleksandroviçin də portretini yaratmışdır.III Aleksandr bu portreti çox bəyənmiş və "Mişenka sanki canlıdır" kəlməsini işlətmişdir(Şəkil 7). Rəssam qısa müddətdə yaratdığı bu portretdə sanki knyazın uşaqlıq dövrünü tutmağa müvəffəq olmuşdur. O, bir az düşüncəlidir, lakin onun baxışlarında uşaqlıq arzuları gizlənir. Onun əynində ağ dənizçi geyimi görünür. Bu rəsm çəkilərkən Mixayılın 14 yaşı olur.Serov III Aleksandırın digər övladları 17 yaşlı Kseninin və 11 yaşlı Olqanın portretlərini də çəkmişdir.



**Şəkil 7.Valentin Serov (185-1911).Mixayıl Aleksandroviçin portreti.Rus Dövlət Muzeyi.**



**Şəkil 8 ValentinSerov(1865-1911) II Nikolayın portreti.1900.Tretyakov qalereyası.**

Serov II Nikalayın da portretini çəkməyə müvəffəq olmuşdur(Şəkil 8).Bu portret imperatorla cəmi iki görüşdə yaradılmışdır.Rəsmin orijinal versiyası saxlanılmır: Qış Sarayı ələ keçirən zaman portret inqilabçılar tərəfindən məhv edilmişdir.Lakin, Serov 1900-cü ildə portreti çəkib qurtardıqdan dərhal sonra onun surətini yaratmışdır. O, şəkilin taleyindən narahat idi, çünki Alexandra Fedorovna bu portreti bəyənmirdi. Portretin çəkilməsi zamanı Aleksandra rəssamın işinə çox qarışır və portretdə düzəlişlər üçün rəssama göstəriş verirdi.Rəssam hətta fırçası və politrasını ona uzadaraq özünüz tamamalayın demişdir.Portretin alınmadığı və Aleksandranın hərəkətindən sonra rəssam bir-neçə dəfə işi dayandırmaq istəmişdir .Nəhayət rəssam II Nikalayda arzuladığı pozanı tutmuş və portreti tamamlamışdır. Portretdə rəssam çarın işdən sonra yorğunluq vəziyyətini tamaşaçıya hiss etdirməyə çalışmışdır. Digər rəssamlardan fərqli olar Serov çar ailəsini dəbdəbəli yox öz gördüyü kimi təsvir etməyə çalışırdı. Portretin surəti Tretyakov Qalereyasında saxlanılır. Bu portretin çəkilişindən sonra rəssam bir daha çar ailəsinin heç bir üzvünün portretini çəkməyə razı olmamışdır[6].

Serov fırçasına məxsus ən məşhur portretlərdən biri knyaginya Yusupovanın portretidir (Şəkil 9).Yusupova knyaz Feliks Feliksoviç Yusupovun həyat yoldaşı,Rusyanın ən zəngin aristokrat ailəsindən idi [3].Serova qədər onun portreti V.K Stember, N.P Bogdanov-Belsky,K.P.Stepanov,N.N.Bekker, İ. K. Makarov,K.E.Makovskiy yaratmışdılar.Yusupova yüksək mədəniyyətə sahib, kübar,ziyalı bir xanım olmuşdur.

Serovun 1902-ci ildə çəkdiyi bu portretin də çəkilməsi xeyli vaxt aparır.Portretdə Zinaida Yusupova uzun,dəbdəbəli paltarda,atlas üzlüklü divanda oturmuş şəkildə təsvir edilmişdir (Şəkil 9).Onun ağarmış yuxarıdan toplanmış saçları ,incə üz cizgiləri,rəngli gözləri rəssam tərəfindən dəqiqliklə təsvir dilmişdir.Heyvanları çəkməkdən böyük zövq alan, bəzən animalist rəssam da adlandırılan Serov knyaginyanında yanında oturmuş ağ it də təsvir etmişdir.Serov 1903-cü ilə Zinaida Yusopovanın həyat yoldaşı knyaz F.F .Yusupovun və kiçik oğlunun portretlərini yaratmışdır.Serov öz xatirələrində bu ailənin çox təvəzökar olduğundan,bu ailənin portretlərini sevə-sevə çəkdiyindən bəhs edir.



Şəkil 9.ValentinSerov (18651911). KnyaginyaYusupovanın portreti.1902.Rus Dövlət Muzeyi.



Şəkil 10 ValentinSerov(1865-1911). Əsgərlər,uşaqlar hardadı sizin mərdliyiniz?!.1905. Rusm dövlət muzeyi.

Serov yaradıcılığında siyasi mövzulara çəkilmiş əsərlər də xüsusi əhəmiyyət kəsb edir. 1905-ci il 9 yanvar hadisəsindən təsirlənən Serov hadisələrin yaxından izləyicisi olur və elə həmin anda rəsm əsərini yaradır (Şəkil 10).1905-ci ilin 9 yanvarında Sankt-Peterburqda çar II Nikolaya, öz tələblərinə dair kollektiv petisiyanı təqdim etmək istəyən işçilərin dinc yürüşü dağıdılır[2].Peterburq meydanına axışan və çara inanan on minlərlə insan - qoca, cavan, böyük, kiçik, xəstə, sağlam və xırda yaşlı uşaqlar böyüklərə qoşularaq çardan mərhəmət gözləməyə başladılar. Onlar tanrıya dualar oxuyurdular. Elə bu zaman meydanı hər tərəfdən mühasirəyə almış çar ordusunun silahlı dəstələri əliyalın, silahsız insanları güllələbaran etməyə başladılar. Meydan qan gölünə döndü. Heç bir insanlığa sığmayan bu hadisə "9 yanvar qanlı bazar günü" adı ilə tarixin səhifələrinə düşdü".

Bu hadisənin təsirindən Serov uzun müddət özünə gələ bilmir .O,Repinə yazdığı məktubda bu hadisələrin heç zaman onun yaddaşından silinməyəcəyindən ,necə təsirləndiyindən bəhs edir. Bu hadisədən sonra Serov Rəssamlıq akademiyasına

üzvlüyündən imtina edir və oranı tərk edir.Serov bu əsərini Maksim Qorkiyə hədiyyə verir.

Serov yaradıcılığı son dərəcə zəngin və müxtəlif idi.O, Böyük portret ustası, təbiətin bədii şərhini gözəl çatdırmağı bacaran,son olaraq tarixi janırda işləyən bir rəssam idi. Bütün bu sahələrdə onun nailiyyətləri böyük idi. Serovun sənətinin müxtəlif təzahürləri onun yaradıcılığının inkişafı prosesində bir-birinə sıx bağlı idi və onun ümumi dünyagörüşü təkamülünü ifadə etdirdi. Portret janrı kimi,mənzərə janrında da rəssamın naliyyətləri danılmazdır.

Serovun bu janırda yaratdığı ilk rəsmlərdən biri "Amsterdam"əsəridir.Həmin dövrdə Serov artıq akademiyanı tərk etmiş və dünya muzeylərini səyahətə çıxmışdır.O ,əsasən Hollandiya muzeylərini gəzmiş və burada olan əsərlərlə yaxından tanış olmuş və rəssam gözü ilə bu rəsimlərə nəzər yetirmişdir.Muzeyləri gəzərkən onun diqqətini daha çox mənzərə janrında olan rəsmlər çəkmiş və həmin dövrdən sonra rəssam öz yaradıcılığında mənzərə janrına xüsusi yer vermişdir[5].



Şəkil 12.Valentin Serov(185-1911).Avropanın oğurlanması.1910.Tretyakov qalereyası.

Valentin Serov 1907-ci ildə dostu L.S.Bakstla Yunanıstana gedir.O Burada Krit mədəniyyəti ilə yaxından tanış olur,aparılan arxeoloji qazıntıları izləyir,Knoss qalasının qalıqlarını görür.Bu səfərdən təsirlənən Serov ilk dəfə olaraq 1910-cu ildə mifoloji mövzuda "Avropanın oğurlanması" "Odissey və Navzikaya" əsərlərini yaradır.Avrpanın oğurlanması əsəri antik yunan mifalogiyasına xas fikirlər əsasında formalaşmışdır(Şəkil 12).Burada Zevs Avropaya vurulur və onu qaçırtmaq qərarına gəlir.Avropanı qaçırtmaq qərarına gələn Zevs öküz simasına girib onu Krit adasına qaçırdır.

1910-cu il Serov özünün ən məşhur əsərlərindən biri olan İda Rubinşteynın portretini çəkir.Bu portret 1911-ci ildə "Dünya İncəsənəti" sərgisində,daha sonra Romada Beynəlxalq rəssamlar sərgisində nümayiş etdirilir.Elə həmin ildə əsəri III Aleksandr muzeyi(İndiki Rus muzeyi) əldə edir.Rəsmin ətrafında çoxlu mübahisələr yaranır.Repin bu rəsmi heç bəyənmir.Serov öz yaratdığı bu işdən çox razı idi və onu bəyənirdi.Serovun modern üslubunda yaratdığı bu əsər sonralar Serovun ən məşhur işlərindən birinə çevrilmişdir.



Şəkil 13.Valentin Serov (1865-1911). Knyaginiya Polina Şerbatovanın portretinə eskiz. 1911. Azərbaycan

Serov 1911-ci ildə rus rəssamı,kolleksioner,mesenat knyaz Sergey Aleksandroviç Şerbatovun həyat yoldaşı knyaginya Polina İvanovna Şerbatovanın portretini çəkmək sifarişi alır.Serovdan təxmini bir il əvvəl knyaginyanın portretini Vasiliy Surikov çəkmişdir.Knyaginya Serovdan bu portretdən tamamilə fərqlənən bir portret yaratmağını xahiş edir. Portretin çəkilişləri çox uzun çəkir.Serov Şerbatovanın müxtəlif interyerlərdə, müxtəlif pozalarda portret üçün eskizlərini çəkir.Birinci eskizdə Şerbatova otağın mərkəzində stulda əyləşmiş şəkildə[1],ikinci eskizdə pilləkanın tutacağına söykənmiş şəkildə,üzü tamaşaşıya tərəf,üçüncü eskizdə Şerbatova otağın mərkəzində, bir əli ilə böyük vazya toxunmuş şəkildə təsvir edilmişdir. Serov portreti sonuncu eskiz əsasında yaratmağa qərar verir.Lakin,ölüm Serova bu portreti yaratmağa imkan vermədi və bu eskizlər tarixə Serovun sonuncu işləri kimi daxil oldu.Eskizlərdən birincisi Azərbaycan Milli İncəsənət muzeyində ,digər ikisi isə Tretyakov qaleriyasında qorunub saxlanılır.

Valentin Serov yaradıcılığı bu gün də diqqət mərkəzindədir.2016-cı ildə Valentin Serovun 150-illik yubileyi münasibəti ilə Dövlət Tretyakov qalereyasında keçirilən sərgisi böyük marağa səbəb olmuşdur. Dövlət Tretyakov qalereyasından verilən məlumatına görə sərgini 400 mindən artıq tamaşaçı ziyarət etmişdir.Rusiya prezidenti Vladimir Putin özü də şəxsən bu sərgidə işdirak etmişdir.

## Ədəbiyyat:

1.Azərbaycan Milli İncəsənət Muzeyi Qrafika fondu.

2.Кудря А."И.ВалентинСеров".Серия "Жизнь замечательных людей".Изд."Молодая Гвардия",2008 г.

3.Ульянов НП. Воспоминания о Серове // Валентин Серов. 1971. Т. 2. С. 119.

4.Серов - М.Ф. Шемякину. 12 октября 1902 года // Валентин Серов в переписке, интервью и документах. Т. 1. Л., 1985. С. 380.

5. https://24smi.org/celebrity/5216-valentin-serov.html.

6. vserov.ru/kartina.php
7. http://valentin-serov.ru/

## Masterpieces of Valentin Serov
## Summary

In the article the author gives detailed information about ValentinSerov's life, creativity, his most famous works and his works included in the collection of Azerbaijan National Art Museum.

Russian painter Valentin Aleksandrovich Serov was one of the most famous painters of his own era, who applied to all genres of painting until the end of his life, mostly known as a portrait painter.Among the most famous works of Serov are the portraits of "Girl with peach", "Girl in sunlight", portraits of emperor II Nicolay,emperor III Alexandr,Q.L.Qirshma, Ida Rubinstein and others. The article gives detailed information about these works.

In 1911, V.Serov received an order from a Russian artist, collector ,mesenate Sergey Aleksandrovich Shcherbatov, to write a portrait of his wife, Polina Ivanovna Shcherbatova, and for this purpose, the artist creates many sketches, depicting (princess) in various interiors and poses. One of these sketches for the portrait, as well as two of the twelve illustrations to the fables of I. Krylov, are in the collection of the Graphics Foundation of the Azerbaijan National Museum of Art. The article gives a complete information about these works, the dates of their creation, their significance and the history of their admission to the museum's museum collection.

## Шедевры Валентин Серова
## Резюме

В статье раскрывается подробная информация о жизни, творчестве и самых известных произведениях Валентина Серова, а также о работах, находящихся в коллекции Азербайджанского национального музея искусств. Русский художник Валентин Александрович Серов был одним из самых значительных мастеров, который на протяжении всей своей жизни обращался к различным жанрамизобразительного искусства, однако приобрел особую известность как портретист. Среди самых популярных произведений, созданных художником,можно отметить такие работы как: «Девочка с персиками», «Девушка, освещенная солнцем», портреты императоров Александра III, Николая II, Генриетты.Л.Гиршман, Иды Рубенштейн и другие, о которых подробно рассказывается в статье.

В 1911 году В.Серов получает заказ от русского художника, коллекционера и мецената Сергея Александровича Щербатова, написать портрет его жены - Полины Ивановны Щербатовой, и с этой целью, художник создает множество эскизов, изображая (княгиню) в различных интерьерах и позах. Один из данных эскизов к портрету, а также две из двенадцати иллюстраций к басням И.А.Крылова, находятся в коллекции фонда «Графика» Азербайджанского национального музея искусств. В статье дается полная дает информация о данных произведениях, датах их создания, их значимости и истории их поступления в музейное собрание музея.

**Rəyçi: s.f.d.X.V.Əsədova**

**Məmmədli Elmira İdris qızı**
Mədəniyyət üzrə Elmi-Metodiki və İxtisasartırma Mərkəzi
elmira.memmedli.70@mail.ru

# BUTA - MƏNİM MƏDƏNİYYƏT İNCİM

***Açar sözlər:*** *ornament, motiv, peysli, Axmim, Sasanilər, naxış*
***Keywords:*** *ornament, motive, paisley, Akhmim, Sassanids, pattern*
***Ключевые слова:*** *орнамент, мотив, пейсли, Ахмим, Сасаниды , узор*

Naxış, bəzək, nəqqaşlıq anlamını verən, bir-birini ritmik bir şəkildə əvəz edən elementlərin birliyindən təşkil olunan ornamentlər olduqca zəngin çeşidə malikdir. Hər bir mədəniyyətin özünə xas olan ornamentləri vardır və bu baxımdan Azərbaycan xüsusilə fərqlənir. Azərbaycan mədəniyyəti ölkəmizin təbiəti kimi zəngin, dolğun və rəngarəngdir. Azərbaycanın qədim və orta əsrlər tarixi, insanların həyat tərzi, düşüncəsi, əmək fəaliyyəti və başqa xalqlarla münasibətlərindən bəhs edən maddi-mədəniyyət nümunələri və tapıntıları üzərində rast gəlinən bəzək ünsürləri günümüzdə də müasir sənətkarlarımız tərəfindən işlənməkdədir. Bu baxımdan aypara, beşguşəli ulduz və bir çox başqa motivlər arasında buta xüsusi əhəmiyyətə malikdir. Müxtəlif geyimlər, əşyalar, alətlər və s. üzərində təsvir olunan butanın nə zaman yarandığı, günümüzədək necə gəlib çıxdığı və dünya mədəniyyətinin bir parçası halına gəldiyi haqqında bu məqalədə məlumat verilir.

Nə qədər digər xalqların mədəniyyət nümunələrində rast gəlinsə də buta dünyada Azərbaycan mədəniyyətinin bir parçası olaraq qəbul olunmuşdur. Azərbaycan xalqına aid dekorativ sənət nümunələrinin və onların üzərindəki təsvirlərin, naxışların, bəzəklərin yaşadılması və gələcək nəsillərə ötürülməsi, dünyaca tanıdılması və bu çərçivədə buta ornamentinin dünyada daha da yayılması və bir Azərbaycan brendi halına gətirilməsi mədəniyyətimiz naminə atılan ən gözəl addımdır.

Buta, dünyada geniş yayılmış şərq bəzək elementidir. Butanın adı ədəbiyyatda "Şah", "Şərq palmettası", "Şərq fasulyəsi", "Fars sərvi", "Kəşmir bəzəkləri", "Peysli", "Tanrının göz yaşı" və s. formada adlandırılır (Səbzəli, 2012: 94). Bu işarənin necə göründüyünü çoxları bilir, amma bilməyənlər də ola bilər. Havadan asılmış şeh damlasını və ya "in-yan"[1]ın bir tərəfini təsəvvür edin. Tam aydın olması üçün deyək ki, bu işarə orta məktəbin botanika dərsliyindəki əyri "ayaqqabı" infuzorunun şəklinə çox bənzəyir. Düzdür, o, minillərboyu dəyişərək, bugünkü bəzəkli dekorativ formasına düşüb. Qərbdə "peysli" olaraq bilinən dizayn motivi, qədim Aryan "boteh" motivindən götürülmüşdür. Boteh farsca kol, kolluq (kiçik ağacların və ya kolların kiçik bir sıx meşəsi), ot mənasını verir. İranda bəzən bu kəlməni bir xurma yarpağı, yarpaqların çoxluğu (bəlkə də təkrarlanmış bir nümunə kimi) və çiçək qönçəsi anlamında izah edirlər. Azərbaycanda və Kəşmirdə (Hindistan yarımadasının şimalında) motivi təsvir etmək üçün istifadə olunan söz isə butadır. Yaxın tarixə qədər, ornamentdən ilk növbədə ipək, yun parçalara (İrandakı Yəzd və Kerman xalçaları, eləcə də Kəşmirdən olan yun şallar) istifadə edildiyi güman edilsə də, ornamentə İranın ticarətlə məşğul olduğu digər ölkələrin parçalar və xalçalarında rast gəlmək mümkündür.

Bu qədim motivin ilk təzahürlərini İskit və Əhəməni memarlığında Homa və ya Simurq qanadları kimi təsvir olunur və Sasanilər dövrünə qədər eyni şəkildə təsvir edilmişdir. Misirin quru iqlimi və qumlu yeraltı təbəqəsi sayəsində, bir çox bölgə ilə müqayisədə parçalar və kağızlar daha uzun müddət yaşaya bilər. Misirdə buta motivinin sələfi kimi görünən naxışlı ipək geyim parçalarından ən qədim məlum nümunələri tapılıb. Bu parçalar eramızın 6-8-ci əsrlərinə aiddir və Yuxarı Misirin bir şəhəri olan Axmimdə tapılmışdır (Chwalkowski, 2016: 206). Eramızdan əvvəl VI-VIII əsrlərdə Yuxarı Misirdəki Nil sahillərində yerləşən Axmim şəhəri yunan təsir dairəsində idi və yunanlaşmış adı da Panopolis idi. Axmim parçalarından tapılan buta motivi Misirin başqa yerlərində tapılmır. Axmim qısa müddət ərzində Sassanilərin nəzarəti altında olub. Həmin şəhər Böyük Dara hakimiyyəti dövründə (e.ə. 522-486) Fars imperiyası tərəfindən fəth edilmişdi. Axmim, Əhəməni imperiyasının Aryan ticarət yollarının qərb ucunda yerləşirdi. Eramızın 19-cu əsrinin sonlarında Axmimin qəbiristanlıqlarında aşkar edilmiş ipək parçaları paragauda adlanan geyim parçalarının bir hissəsi idi. Bu geyim parçasının qadınlara aid olduğu düşünülür. Paragauda sözünün Hind-İran mənşəli olduğu görünür. Burdan buta motivinin bu əraziyə farslar vasitəsilə gəldiyini düşünmək mümkündür.

Axmim buta motivləri stilizə edilmiş böyük ölçülü yarpaqlar olan ağacla üzümü birləşdirən meyvə kimi görünür. Daha sonra (toxunmamış) buta ilə uyğun olan dizayn elementləri, açılan nöqtələr və daxili quruluşu əhatə edən motivin ətrafındakı bir haşiyə ilə işarələnmişdir. Sasanilərin son illəri və İslamın ilk əsrlərində sərv ilə buta arasındakı simbiyotik əlaqənin bəzi əlamətləri müşahidə edildiyi üçün bu qədim

[1] Çin fəlsəfəsində ilkin kosmogenez mərhələsi. (Daosizm)

motivin sərvdən qaynaqlandığı düşünülür. Butanın təkamülünün tarixi baxımından bu naxış çox əhəmiyyətlidir, çünki sərv ilə buta 17-18-ci əsrlərə aid sənət əsərlərində istifadə edilmişdi.

Buta ilə bağlı digər tapıntılar da atəşpərəst xalq ənənəsində həyat ağacı kimi göstərilən sərv ilə əlaqələndirilir. Burdan belə bir qənaətə gəlmək olar ki, Buta motivi Zərdüştilik dini ilə bağlıdır. Bundan əlavə, Buta motivinə bəzən "Zərdüşt alovu" deyilir.

Buta motivlərinin müxtəlif formaları var. Bu müxtəlif formalar da törəmə formalarla əlaqələndirilə bilər və bəzən parça, xalça və oyma olsun eyni dizaynda görülə bilər. Axmim toxumasının fraqmentləri isə butada bəzi dəyişikliklərin olduğunu göstərir.

Ticarət əlaqələri sayəsində zamanla Buta motivi olan parçalar Afrika və Hindistana qədər yayıldı. Buta ilə Avropanın tanışlığı 17-ci əsrin ortalarında baş verib. Bu dövrdə Hindistanın bəzi liman şəhərlərini ələ keçirən ingilislər Şərqin ticarət bazarına girir. Bu dövrdə buta ornamenti olan parçalardan hazırlanan şalları yalnız aristokrat və varlı insanlar ala bilirdi. İngilislər buta naxışlarını o qədər bəyənirdilər ki, 19-cu əsrin sonlarında Şotlandiyada "peysli" adlı parça istehsal etməyə başlamışdılar. Bu səbəblə bugün belə Buta Avropada "peysli" olaraq bilinir. Şotlandiyada istehsal edilən məhsullar Hindistan məhsullarına nisbətən daha aşağı keyfiyyətli idi, rənglərin azlığı butaya cəlbediciliyi verə bilmirdi.

Butanın fərqli ölkələrdə istifadə olunması ona fərqli adların verilməsinə səbəb olmuşdur. Məsələn, Hindistanda buta bir damla şəklindəki nanə, Qaneşa tanrısı və ya xurma yarpağı ilə eyniləşdirilir. Hindlilərin fikrincə buta, həyatın formalaşmasını, enerjini və təbiətin gücünü təmsil edir. Bütün ərəb ölkələrində buta ornamentinə "Tanrının göz yaşları" deyilir. Butanın bir digər adı "Fars sərvi" sonsuzluğu və əbədi həyatdan bəhs edən sərv yarpağını simvollaşdırır. Türkiyədə bu ornament "Şərq xiyarı" və ya "paxla" olaraq adlandırılır.

Azərbaycanda buta odun stilizə olunmuş ornamentini simvolizə edən damla şəklində naxış kimi bilinir. Ölkədə xalça, parça və bəzək əsərlərinin üzərində Buta motiv naxışları və rəsmlərinə rast gəlinir. Buta ornamentindən Azərbaycanda dekorasiya ilə yanaşı memarlıq abidələrində də geniş istifadə olunur.

Ehtimala görə, buta Sanskrit dilində "atəş" (buta - puta - buta) sözündən götürülmüşdür. Buta bu ölkədə bitən eyni adlı kiçik bir kol bitkisinin adıdır. Bu bitkinin çiçəkləri butanın formasına bənzəyir və xüsusi bir ətri və məstedici xüsusiyyətlərə malikdir. Bu bitkidən zərdüştilərin məbədlərində və Veqa, Anahit, Mitras və daha sonra Ahuraməzda ibadət evlərində dini ritual zamanı istifadə edilirdi (Dashkova, 2011: 38).

Rusiyada buta ornamenti Avropada olduğu kimi 18-ci əsrdə aristokrat təbəqənin istifadə etdiyi Kəşmir şallarının ölkəyə gəlişi ilə populyarlıq qazandı. Butadan Rusiyada o qədər geniş istifadə edildi ki, ətraf ölkələrdə bu ornamenti rus nümunəsi olaraq görməyə başlamışdılar. 19-cu əsrin əvvəllərində ölkədə İvanovo pambıq parçaları və Pavlovposad şalları üzərində buta təsviri olan geyim parçaları istehsal olunmağa başlamışdı. Paytaxt Moskvadan 68 km aralıda yerləşən Pavlov-Posad şəhərində bugünkü günümüzdə də buta motivi olan parça istehsalı davam edir.

XX əsrin əvvəllərində unudulan buta, 60-cı illərdə yenidən dəbə mindi və populyarlaşdı. Məşhur amerikalı müğənni Con Lennon, istifadə etdiyi "Rolls-Royce" markalı avtomobilində buta motivindən istifadə etmişdi. (De Guise, 2008: 155). Müğənni bundan başqa buta motivi olan köynəkdən mütəmadi olaraq öz konsertlərində geyinirdi. Beləcə, buta motivi ABŞ-da bu dövrlərdə xeyli populyarlaşdı. 70-ci illərdə ABŞ-da buta modeli müxtəlifliyi, azadlığı və sevgini yüksək qiymətləndirən hippilərin də diqqətini cəlb etmişdi. Butanın dünyaca məşhurluğu bununla bitmir. 80-ci illərdə Missoni, Etro və digər bir çox moda şirkəti keyfiyyətli moda işlərində naxışlı dizayndan fəal şəkildə istifadə etməyə başladı. Etro üçün "buta" motivi bütün kolleksiyaların bəzəyi olmuşdu. Butadan ornament kimi təkcə geyimdə deyil, ətriyyat, mebel və tekstil sahələrində də istifadə olunurdu. Məsələn, ingilis şirkəti Cole & Son üzərində buta təsviri olan bir neçə divar kağızları kolleksiyasını buraxmışdı.

Buta motivi Azərbaycanın milli ornamentində ən qədim sayılır. Buta, ölkədə bilinən naxış nümunələri arasında görkəmli bir yer tutur. Ölkənin qədim incəsənət nümunələrində yalnız buta ilə bəzədilmiş əsərlər görmək mümkündür. Bəzi rəsm işləri əl ilə diqqətlə seçilərək tərtib edilmişdir. Bu sənət nümunələri müxtəlif formada, əsasən armud ağacından sənətkarların özləri tərəfindən düzəldilirdi. Azərbaycanda buta ornamenti atəşin simvolu hesab olunur. Sasanilər sülaləsi dövründən geniş istifadə olunmağa başlayan buta motivi daha sonra Səfəvilər, Qacar sülalələri dövründə Azərbaycanda əsas toxuma nümunəsi olmuşdur. Bu dövrlərdə naxış Şaha aid geyimdə, onun tacında və vəzirlərin geyimində istifadə edilirdi. Ümumilikdə, Səfəvilər və Qacarlar dönəmində xalça toxucularının xalçaları bəzəmək üçün ən çox istifadə etdikləri ornament buta olmuşdu (Hillmann, 1984: 85).

Azərbaycanda ən çox geyimlərə buta ornamenti olan naxışlar tətbiq edilir. Hər hansı bir milli geyimimizi götürsək, orda bu və ya digər formada butalardan və müxtəlif digər elementli naxışlardan istifadə olunduğunu müşahidə etmək olar. Fərqli mədəniyyətlərə sahib olan Slavyandilli xalqların geyimlərində naxışları əsasən geyimin ətəyinə vururlar. Türkdilli Orta Asiya xalqlarında isə əsasən məxməri naxış daha çox tətbiq edilir. Əlbəttə ki, naxışlar geyimlərə xaotik formada tətbiq edilə bilməz. Azərbaycan xalq

düşüncəsinə əsasən buta anlayışına baxış folklorşünas və etnoqrafların məsələyə münasibətində müəyən fərqliliklər yaradıb. Bu münasibət elə butanın özü kimi çoxçalarlı, əlvan naxışlıdır. Bunun səbəbi butanın rəmzi qatlarında müəyyən sirlərin indiki dövrümüzə qədər tam olaraq açılmamasıdır. Buta anlayışı mifik düşüncə dünyasından qaynaqlandığına görə, əvvəlcə qədim dövrlərin fikir palitrasına müraciət etmək lazımdır.

Butalar barədə danışarkən bəzən «küsülü buta» ifadəsindən istifadə edilir. Əlbəttə ki, buradakı butalar oğlan və qız olmaqla əks cinsi təmsil edir. Deməli, bu, birbasa butaların əks cinsliklərinə işarədir. Birinin oğlan, o birinin isə qız buta olduğunu özü-özlüyündə simvollaşdırır. Sağ tərəfə əyilən buta naxışı oğlanı, sol tərəfə əyilmiş buta isə qızı ifadə edir. Professor Mirəli Seyidov isə bunu butanın odla əlaqəsindən bəhs edərkən, küləyin atəşin şöləsini sağa doğru istiqamətləndirməsi kimi qələmə vermişdi. Bundan başqa buta, eyni zamanda «qönçə» anlamını verir. Qönçənin təsvirinə baxsaq, görərik ki, onun odla bağlılığını göstərmək üçün xalq sənətkarları – naxışçılar, memarlar, xalçaçılar, dulusçular və başqaları onun başını sağ tərəfə doğru əyirdilər. Burda belə bir düşüncə formalaşırdı ki, guya külək onun şöləsini tərpədir. (İsayeva, 2015: 39-40).

Buta naxışlarına diqqətlə baxdıqda enliyarpaqlı ağacın yarpağı təəssüratı yaradır. Bu halda bir-birlərindən əks istiqamətə baxan buta naxışlarının rəmzi anlamı daha da aydınlaşır. Belə ki, əks tərəfə istiqamətlənən buta naxışlarının mərkəzindən xəyali bir düz xətt keçir. Ağac budağının hər iki istiqamətindən çıxan butaların isə bitdikləri budağın əks istiqamətinə yönəlməsi təbii prosesdir. Nəticədə bir-birinə baxan kollar tamamilə bir budağın əks tərəfləri ilə əhatə olunur və ayrıca bir budağın ətrafında birləşirlər. Buta naxışlarının əks istiqamətə yönəlməsi bir ağacın budaqlarındakı yarpaqların əks istiqamətə meyilli olub əyilmələri kimi təbiiliyi göstərir. Burdan elə bir fikir formalaşır ki, butalar da sevgililər kimi birləşib bir ağac budağını ifadə edirlər.

Etnoqraf Solmaz Məhərrəmova «Basqal kəlağayıları» məqaləsində naxışlardan bəhs açarkən «böyük buta» naxışını «şax» kimi izah edir: «Kəlağayılıq məhsul dəzgahda toxunduqdan sonra 150–160 santimetr ölçüdə qayçıyla kəsilir. Daha sonra soda əlavə edilmiş suda 20–30 dəqiqə qaynatmaq lazımdır. Kəlağayı suda qaynadıldıqdan sonra 2–3 dəfə soyuq suda yaxalanılır, yüngülcə sıxılır və asılaraq qurudulur. Naxışlama prosesi qurudulmadan sonra başlanır. Üzəri oyulmuş nəbati, həndəsi və kosmoqonik təsvirlərdən ibarət olan qəliblər vasitəsi ilə kəlağayı naxışlanır. Bu qəliblər adətən armud, qoz, cır alma ağacından hazırlanır. Qəliblərə naxışların formasına görə müxtəlif adlar verilir . Bu naxışlara misal olaraq «günəş», «pullu qəlib», «simayi şəms», «haşiyə», «şax» (böyük buta), «buta» (kiçik buta), «xarı bülbül», «xətayi» və s. göstərmək mümkündür.” «Şax» adlı kəlağayı naxışı mötərizə daxilində «böyük buta», «buta» isə «kiçik buta» kimi göstərilir. Bu isə bilavasitə də olsa, butanın ağacla (şaxla) – budaqla bağlı söz olduğuna bir işarədir (İsayeva, 2015: 41).

Butanın növləri çoxdur, bəziləri simvolikdir. Yaxın Şərq və Avropa ölkələrində yaxşı bilinən, ucu əyri bir ucu olan bir badam görünüşü olan butanın motivini vurğulamağa dəyər. Bu motiv tez-tez Azərbaycan ustaları tərəfindən istifadə olunur. Xalça naxışının demək olar ki, ayrılmaz hissəsinə çevrilən buta Gəncə zonasında xüsusi populyarlıq qazanmışdır. Buta naxışlarına Azərbaycan xalçalarının bir neçə növündə rast gəlinir, bunların arasında "Xilə-buta", "Şirvan-buta", "Şabalıt buta" xalçalarını qeyd etmək olar.

Buta ornamentini 4 istiqamət üzrə qruplaşdırmaq mümkündür:

Birinci qrupda buta motiv olaraq istifadə olunur. Bu zaman alınan yeni motiv xalçaçılıq mərkəzlərinin adını xatırladır. Muğan xalçalarına xarakterik olan buta “Muğan buta”, Abşeron xalçalarına xarakterik olan buta “Xilə buta”, “Bakı buta”, Şimal - qərb ərazilərin xalçalarına xarakterik olan buta “Şirvan buta”, Cənubi Azərbaycan xalçalarına xarakterik olan buta “Sarabi buta”, “Mir buta”, şimal - qərbi Azərbaycan xalçalarına xarakterik olan buta “Gəncə buta” kimi adlandırılıb.

İkinci qrup butalar “bala buta”, “həmli buta”, “balalı buta”, “evli buta”, “qoşa arvadlı buta”, “arvad - uşaqlı buta”, “baba buta” kimi adlanır. Bu qrup butalar ailə rəmzi kimi istifadə edilir.

Üçüncü qrupa simvolik məna daşıyan butalar aid edilir. “Cinə buta” - igidlik əzəmətlilik rəmzi, “lələk buta” şücaət, fədakarlıq, yüksək rütbə və böyüklük, əzəmət, cah - calal rəmzi, “küsülü buta” başı müxtəlif tərəflərə dönmüş, kürək kürəyə söykənmiş, “qovuşan buta” başı üz-üzə dönmüş şəkildə təsvir olunur. “Fətir buta” Qarabağda bişirilən buta formalı çörəyin-fətirin adından götürülüb. “Gülabdan buta” dini ayinlər zamanı istifadə edilən, içərisinə gülab tökülən qabın formasına bənzədilən buta. Qədim zamanlarda rəsmi kağızlar və ya rəsmlərdə sevgililərin qəhrəmancasına hərəkətini buta formasında təsvir edirdilər. Mətnlə təsvir olunmuş buta “yazılı buta”, işərisində rəsm olan butaya isə “mətn buta” deyilir.

Dördüncü qrupa müxtəlif butalar daxil edilir: “saya buta”, “əyri buta”, “dilikli buta”, “qıvrım buta”, “çiçəkli buta”, “qotazlı buta”. Butanın kompüter təhlilini apararaq, hansı əsas elementlərdən necə alınmasını

öyrənərək, onun dörd sayda ellips vasitəsilə yarandığını görürük ki, bu da simvol olaraq, əsasən ailə rəmzi sayıla bilər (Rəsulova , 2017: 54).

Nəticə olaraq qeyd edə bilərik ki, buta hər nə qədər dünyəvi ornament olsa da bu motiv növləri və işləndiyi sahələr baxımından Azərbaycanda xüsusilə fərqlənir. Buna görə, buta motivi dünyada Azərbaycanla assosiasiya olan simvol kimi bilinir. Bu mənada Azərbaycan mədəniyyətinin ən əsas parçası olan butanı gələcək nəsillərə ötürmək əsas missiyamız olmalıdır.

## Ədəbiyyat:

1. Rəsulova Gülsənəm , (2017), “Dekorativ - tətbiqi incəsənət sahələrində tətbiq olunan ornamentlərin analizi”, Magistr dissertasiyası.
2. İsayeva Zərifə, (2015), “Müasir geyimlərdə istifadə edilən ornamental kompozisiyaların analizi”. Magistr dissertasiyası.
3. Farrin Chwalkowski, (2016), Symbols in Arts, Religion and Culture: The Soul of Nature
4. Leyla Səbzəli,(2012), "Zaqadochnaya oqnennaya buta",
5. «Region plus» jurnalı, №10 (150),s.94.
6. Lyudmila Dashkova, (2011), "Magiya vyazaniya", c.2.
7. Lucien De Guise, (2008), “Beyond Orientalism: How the West was Won Over by Islamic Art”.
8. Michael C. Hillmann,(1984), “Persian Carpets”.

**Buta – pearl of my culture**

**Summary**

Ornament shave a very rich variety and also different meanings like pattern, decoration, painting, tracery and are established of rhythmically interchangeable elements. Every culture has its own ornaments, and in this respect, Azerbaijan is especially different. Azerbaijani culture is rich, solid and colorful as the nature of the country. The ornamental elements found in the material and cultural examples and findings describing ancient and medieval history of Azerbaijan, its people, their way of life, their thinking, their work and relationships with other nations, are still being used and developed by our contemporary artists. In this respect, the crescent, the five-pointed star and the buta amongst many other motives are of particular importance. This article explains the time when the buta, describedon different clothes, items, tools, etc.,was formed,how it came to this day, and how it became part of the world culture. No matter how many other cultures are found using buta, itis accepted as a part of the Azerbaijani culture in the world. It is important to keep alive the decorative arts of the Azerbaijani people and their illustrations, patterns, ornaments,transmit them to next generations, and in this context to popularizethebuta and makeit an Azerbaijani brandworldwide.

**Бута – жемчужина моей культуры**

**Резюме**

Орнаменты, ритмически сменные элементы, означающие узоры, декорация и украшение, очень богаты разнообразием. Каждая культура имеет свои орнаменты, и в этом отношении Азербайджан особенно отличается. Азербайджанская культура богата, разнообразна и красочна, как природа страны. Декоративные орнаменты, найденные в материальных и культурных примерах и находках,описывающее древную историю Азербайджана,его народа, их образа жизни, их мышления, работы и отношений с другими народами, до сих пор используются и развиваются нашими современными художниками. В этом отношении полумесяц, пятиконечная звезда и миндалевидный узор называющийся бута среди многих других орнаментальныхмотивов имеют особое значение. В этой статье объясняется, когда сформировался бута,нарисованная на различных одеждах, предметах, инструментах и т.д., как он дошел до наших дней и как он стал частью мировой культуры. Независимо от того, на сколько других культурах был использован бута, он считается частью азербайджанской культуры в мире. Важно сохранить декоративное искусство азербайджанского народа и его иллюстрации, узоры, орнаменты, передать их следующему поколению, и в этом контексте популяризировать буту и сделать ее азербайджанским брендом во всем мире.

**Rəyçi: s.f.d. A.Usubəliyev**

# JURNALIN İÇİNDƏKİLƏR

**FƏLSƏFƏ PHILOSOPHY ФИЛОСОФИЯ**



**ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ**



**BEYNƏLXALQ MÜNASİBƏTLƏR INTERNATIONAL RELATIONS МЕЖДУНАРОДНЫЕ ОТНОШЕНИЯ**



**PEDAQOGİKA PEDAGOGY ПЕДАГОГИКА**



**TƏDRİSİN METODİKASI THE METHODOLOGY OF TEACHING МЕТОДИКА ПРЕПОДАВАНИЯ**



**SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУСТВОВЕДЕНИЕ**

